XX əsrin əvvəllərində yaşamış şairlərinin söz dünyasına nəzər salsaq, maraqlı mənzərə ilə qarşılaşmış oluruq:

Edibdir nöqteyi-xalini mərkəz qəlbi – üşşaqə
Mədarından xilaf etməz, könül pərgarə mayildir
*(Mirzə Həsib Qüdsi)* (Rəmzi, 1981, s. 21).
Qaşın taqinə taqindən əyilmiş bircə mişkin tel,
Məgər gülzari-cənnətdir bitirmiş bir giyəh əyri?
*(Mirzə Abbas Şahin)* (Rəmzi, 1981, s. 34)

Yuxarıdakı misraların çağdaş qəzəlxan şairlərin qəzəlləri iə müqayisəsi də maraqlı görünür. Müasirimiz Talib də sələfinin yolu ilə gedərək sirli-soraqlı dünyanın hikmət dolu seyrinə belə çıxır:

Qaşın mehrabinə səcdə, gətirmiş aşiqi vəcdə,
Odur ki, aşiqani-Həq sənə çün iqtida eylər.
Ağ üzündə qara xal nöqteyi-bismillahdır,
Yazıb eşqin qələmi qarə, bəyaz üstündən.

Dairənin burada göstərilən semantik məzmununa "kosmik yumurta" versiyasını da daxil etmək olar. Qədim insanların kosmoloji təsəvvürlərini naxış-kodlar kimi də dəyərləndirə bilərik. Mənbələrə əsasən deyə bilərik ki, bütün materiya və bütün enerji müəyyən anda bir nöqtədə cəm olmuşdur. Həmin nöqtə böyük cazibə qüvvəsinin təsiri altında sıfır həcmə malik olmuşdur. Həmin nöqtənin partlayışı tarixdə və elmdə Böyük Partlayış nəzəriyyəsi adını alıb ki, bu barədə divan ədəbiyyatının ünlü nümayəndələrindən Nizami, Füzuli də xeyli maraqlı düşüncələri ilə yadda qalmışlar. Şübhəsiz, bu mütəfəkkir-şairlər elmə sonradan bəlli olan bir çox sirləri ilahiyyat elmlərinin məzmunundan əldə etmilər.

Nəsimi söyləyir:

Zilli sanidir saçın, innə ileyhə rəciun,
Qul kəfanın aftabı xoş məanı göstərir (Nəsimi, 2004, s. 121).

Fəlsəfə və irfanda "müstədir hərəkətlər" anlayışı var ki, ilahi məzmunlu əsərlərdə də bu yanaşmadan istifadə edilir. Yəni burada cismsiz vücudla ətrafı seyr etməsinə, "innə ileyhə raciun" məqsədinə müraciət edilir. Hətta mədəniyyətşünaslıqda mədəni dairələr nəziyyəsi də vardır ki, onlar mədəniyyətin bir nöqtədən yarandığını təsdiq edirlər. Bu gün elmi ədəbiyyatda daha çox "post irfan" ifadəsi ilə qarşılaşırıq ki, burada "laməkan və lazəmanlıq məsələsi tamamilə mənsux, yəni kənara qoyulmuşdur. "Post irfan" fənafillah deyil, şahid axtarışındadır" (Aruz, 2017).

Çağdaş şeirdə Füzuli dəsti-xətti bu şeirlərin təkcə ideyasını təşkil etmir. Müasir şairlərin çoxu Şərq poetikasının incəliklərinə daha çox divan şeiri vasitəsilə yiyələnirlər. Yaradıcılığında Füzuli təsiri hiss olunan, neoklassik əruzun hər üç istiqamətində yazıb yaradan İlqar Fəhminin fəaliyyəti sənət keyfiyyətlərinə görə ən çox seçilən və oxunulan poetik nümunələrdir. Məlum poetik qəliblərə novatorcasına yanaşmış şairin şeirlərinin musiqi-ritmik duyumu da diqqəti cəlb edir:

Vaxt var idi birgə idik, sevgilim, mən və dəniz
İndi yox heyf ol dilara, bir dənizdir, bir də mən (Fəhmi, 2022).

Hacı Akif adlı şairin yaradıcılığı da bu cəhətdən rəngarəngliyi ilə diqqəti cəlb edir. Şair yaradıcılığında Şərq poetikasının sütunlarından bəlağət və fəsahət kimi poetik kateqoriyalara aid olan maraqlı fiqurlar yaratmağa müvəffəq olmuşdur ki, burada birbaşa Füzuli təsiri hiss olunur:

Nə xoş ki olmadım sultan, gedə vicdan qalam nalan,
Tutum hər bir kəsə nöqsan, atım böhtan qurum divan.
(Hacı Akif, 2023, s. 238).

Yuxarıdakı nümunədə şair "səc-müvazinə"dən bəhrələnərək tarazlı səc yaratmış və bunula bərabər "ləff və nəşr" poetik fiquruna da müraciət etmişdir. Başqa bir nümunədə:

Gələ üstümə nə qədər bəla, deмərəm xeyir, deyərəm bəla,
Belə səpt olub yazılan qədər, çəkərəm gələ nə qədər cəfa (Hacı Akif, 2023, s. 21).

Sonuncu nümunədə müəllif "təqid", "təqsim", "təzad", "cinas", "touzi" və s. bəla və qədər sözləri cinas olub fərqli məzmunlar bildirir. Bu ifadələrin ətrafında isə müəllif digər vasitələrdən də istifadə etmişdir ki, nəticədə çox melodik bir deyim alınmışdır. Hacının əsərləri janr və forma cəhətdən də rəngarəngdir. O, əruz vəznində qəzəl, qəsidə, müxəmməs, mürəbbe, müsəddəs, tərcibənd, məsnəvi,

mərsiyə, nəsihətnamə, səfərnamə, şikayətnamə, təxmis və s. janr və formalarda nümunələr yaratmaqla yanaşı, ara-sıra heca vəzninə də müraciət etmişdir. Hacı Akif klassik şeir formalarına novatorcasına yanaşaraq, maraqlı hilyə, məqtəl və minacatlar, rəvan bəhri-təvillər, vaqinamə, ibrətnamə, vücudnamə və s. poetik örnəklər yaratmışdır. Təbii ki, Yaradanın insan ruhuna bəxş etdiyi təbilham danılmaz faktordur. Lakin klassik xəzinəmizin dəyərlərinə böyük sevgi və məsuliyyətlə yanaşmaq birbaşa divan mədəniyyətinə, xüsusilə Füzuli irsinə varislik kimi dəyərləndirilə bilər (Nəsimi, 2004).

Yeniliklərlə dolu olan ötən əsrin sonu və XXI ərin əvvəllərindən şeirdə – sənətdə olan yeni meyil və təmayüllər çağdaş şeirin maraqlı mənzərəsini yaratmaqdadır. Ramiz Rövşənin, Vaqif Səmədoğlunun, Vaqif Bayatlı Odər kimi bir çox müəlliflərin əsərlərinə hakim olan fəlsəfi ruh bir çox nöqtələrdə onları dahi sələfləri ilə birləşdirmişdir. R. Rövşən "Dərd" şeirində söyləyir:

Nə uzundur dərdin ipi,
Dolanır dörd bir tərəfi.
Dünyanın dərdli tərəfi
Dərdsiz tərəfini çəkir.

Dünyadan bezmir yenə də,
Şükür deyib bu günə də,
Adam lap öz dərdini də
Sevinə-sevinə çəkir (Ramiz, 2013).

Təbii ki, buradakı dərd faciə konsepsiyası deyil, vəziyyətə Vaqifsayağı yanaşmaqdır. Vaqif "Toy-bayramdır bu dünyanın əzabı, Ağlı olan ona gətirər tabı", – söyləyərək böyük Füzulinin qəm konsepsiyasından bəhrələnmişdir. Akademik Nizami Cəfərov yazır: "Vaqif düşüncə tərzi Füzuliyə oppozisiya təşkil etməklə yanaşı, həm də onun davamıdır... XX əsrdə Əliağa Vahid məhz Vaqif düşüncə tərzinin deformativ təsirinə məruz qalmış Füzuli düşüncə tərzinin ekzotikasıdır" (Zeynalova, 2011, s. 135).

Ali gözəllik daşıyıcısı olan söz şairlərin yaradıcılığında insanı hər zaman mənəvi-ruhani inkişafa, daxili nurlanmaya yönəldir. Füzulinin qəmi o qədər əzəmətli səslənir ki, şeir qoşan hər kəs qəlbinin simlərini orada kökləyə bilmişdir.

Degildi böylə, dəmində bir əhli-işrət idi,
Bu qanlar içməyə mötad gördüyün könlüm (Füzuli, 2005, s. 167).
Eşqdən canımda bir pünhan mərəz var, ey həkim!
Xəlqə pünhan dərdim izhar etmə zinhar, ey həkim! (Füzuli, 2005, s. 162)

Azərbaycanın dekadent şairlərindən olan Vaqif Səmədoğlunun aşağıdakı misraları yada düşür:

Günaha batmağım gəlib, ay Allah
Cəsarət dəmidir, saxlama məni.
Sənə inamdan da gözəl bir qız var,
Xəyanət dəmidir, saxlama məni (Səmədoğlu, 2014).

Bu misralarda ənənə elə maraqlı şəkildə inkar edilmişdir ki, inkarla təsdiq harmoniya içərisində birləşə bilmişdir. Böyük Füzuli söyləyir:

Yarəb, bəlayi-eşq ilə qıl aşina məni,
Bir dəm bəlayi-eşqdən etmə cüda məni (Füzuli, 2005, s. 195).

Dahi şairin məşhur qəzəlinə xas olan batini duyum, bəla ilə aşinalıq bu misraların hər sözündən boy göstərir. Maddi həvəsə qarşı inkarçı ruh Vaqif Səmədoğlunun poeziyasında bir arxetipə çevrilərək Azərbaycanın fikir tarixini sanki yenidən vərəqləmişdir.

## Nəticə

Füzuli və çağdaş şeirimiz əsasında apardığımız paralellər göstərir ki, Füzuli irsi daha çox iki yolla poeziyaya təsir göstərməkdədir. Bunlardan birincisi birbaşa Füzuli dəsti-xətti ilə yazmaq, ikincisi isə bu poetik irsdən ideya-mövzu qaynağı kimi bəhrələnmək olmuşdur ki, buna daha çox assosiativ poeziyanı göstərmək mümkündür. Digər tərəfdən isə çağdaş ədəbi proseslər ədəbiyyatımızda modernizmin, postmodernizmin estetik təbiətinə uyğun şəkildə yenilənməkdədir. İstər

ənənənin inkarı, şüur axını, ekzistensial tənhalıq olsun, istərsə də inkarın inkarı olsun, hər bir halda ədəbiyyatda sənətin mənşəyinə qayıdış hiss edilməkdədir. Təfəkkür insan şüurunun ümumiləşmiş və vasitəli inkasından ibarət idrak prosesi olduğundan, onun alt qatı daha sürətli işləyir. Elə bu səbəbdən də şairin misralarını oxuyarkən ənənə və ona münasibətin mahiyyəti daha çox assosiasiya olunur. Zənnimizcə, hansı ədəbi cərəyana, hansı poetik formaya aid olmasından asılı olmayaraq, çağdaş şeirdə düşündürücü fəlsəfi-psixoloji mühakimə, ictimai-əxlaqi düşüncə, intuitiv duyum varsa, orada bir Füzuli yaşamaqdadır.

## Ədəbiyyat

1. Aruz, S. (2017). *Post irfan, ya müasir irfan nəzəriyyəsi.* https://edebiyyatqazeti.az
2. Bünyadov, Z., Məmmədəliyev, V. (tərcümə ed.). (1991). *Qurani-Kərim*. Azərnəşr.
3. Fəhmi, İ. (2022). *Qəzəllər*. https://1001info.az. ilqar-fehmi-qezeller-
4. Füzuli, M. (1992). *Şikayətnamə*. http://web.anl.az
5. Füzuli, M. (2005). *Seçilmiş əsərləri*. I cild. Şərq-Qərb.
6. Hacı Akif. (2023). *Haqqın izi ilə*. Elm və təhsil.
7. Mahir, H. Ə. (2012). *Füzuli qəzəllərinin şərhi*. I cild. Elm və təhsil.
8. Nəsimi, İ. (2004). *Seçilmiş əsərləri*. II cild. Lider.
9. Rəmzi, C. (1981). *Deyilən söz yadigardır*. Yazıçı.
10. Ramiz, R. (2013). *Poeziya*. https://kayzen.az/blog/poeziya/13359
11. Səmədoğlu, V. (2014). *Günaha batnağım gəlir, ay Allah*. https://qafqazinfo.az/gundem-12/
12. Topbaş, O. N. (2008). *Könül bağçasından məhəbbətdəki sirr*. İpək yolu.
13. Vahid, Ə. (2005). *Əsərləri*. http://anl.az/el/
14. Zeynalova, A. (2011). *Əliağa Vahidin poetik irsi.* Elm və təhsil.

Daxil oldu: 01.08.2024
Baxışa göndərildi: 05.09.2024
Təsdiq edildi: 17.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/26-30

**Təhminə Əliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Quba filialı
tarix üzrə fəlsəfə doktoru
tehmine.eliyeva@quba.adpu.edu.az
https://orcid.org/0009-0001-2520-4371

# Qafqaziya jurnalı və jurnalda Qafqaz birliyi məsələsi

**Xülasə**

İkinci Dünya müharibəsindən sonra Almaniya, Türkiyə və bu kimi bir sıra Avropa dövlətlərində soyuq müharibə ilə əlaqədar hər iki tərəfin mövqeyi və mənafelərini öyrənmək mubarizəsi davam edirdi. Bu dövrdə ən çox aktual olan məsələlərdən biri də Sovetlər birliyi tərəfindən istila olunmuş xalqları, entik milli azalıqların azadlıq uğrunda mübarizəsi idi. Bu məqsədlə nəşr olunan dərgilərdən biri də Qafqaz siyasi mühacirlərinin Münhendə təşkil etdiyi Şimali Qafqaz Milli Komitəsinin mətbu orqanı olan Qafqaziya jurnalı idi.

Məqalə qısa olaraq Qafqaz birliyinin tarixi və önəmindən, Qafqaz xalqlarının XX əsrin 50-ci illərində mübarizə üsulunun müştərək aparılmasından bəhs edir. Qafqaz çoxlu etnos və subetnoslardan ibarət olan bir coğrafi məkandır. Bu məkanın Orta Asiya və Avropa üçün önəmi hədsizdir. Bu ərazidə müstəqil olmaq və uzun zaman müstəqil qalmaq üçün birləşərək konfederasiya şəklində qurum yaradılmasının əhəmiyyətini bilən siyasi mühacirlər zaman-zaman mübarizə aparmışdılar. Qafqaziya jurnalı da həmin konfederasiya fikrini təbliğ edən dərgilərdən biri olmuşdur. Məqalədə bu mövzu əhatəli şəkildə araşdırılır.

***Açar sözlər:*** *mühacir, jurnal, Qafqaz, birlik, mübarizə, Qafqaziya*

**Tahmina Aliyeva**
Guba branch of Azerbaijan State Pedagogical University
Doctor of Philosophy in History
tehmine.eliyeva@quba.adpu.edu.az
https://orcid.org/0009-0001-2520-4371

# The Caucasian Journal and the Issue of the Caucasus Union in the Journal

**Abstract**

After the Second World War, in Germany, Turkey and a number of other European countries, the struggle to learn the positions and interests of both sides regarding the Cold War continued. One of the most urgent issues in this period was the struggle for freedom of the peoples invaded by the Soviet Union, former national minorities. One of the magazines published for this purpose was Kafkasya magazine, the press organ of the North Caucasus National Committee organized by Caucasian political emigrants in Munich.

The article briefly talks about the history and importance of the Caucasian union, the joint struggle of the Caucasian peoples in the 50s of the 20th century. The Caucasus is a geographical space consisting of many ethnic groups and sub-ethnic groups. The importance of this place for Central Asia and Europe is immense. In order to be independent and to remain independent for a long time, political immigrants who knew the importance of forming a confederal institution by uniting in this area fought from time to time. Kafkasia magazine was one of the magazines that propagated the idea of confederation. This topic is comprehensively explored in the article.

***Keyword:*** *immigrant, journal, Caucasus, unity, struggle, Caucasus*

## Giriş

Qafqazya jurnalı (almanca Der Kaukasus – T. Ə.) Əli xan Qantəmirin redaktorluğu ilə Qafqaz siyasi mühacirlərinin 1951-ci ilin avqustundan 1952-ci ilin dekabrınadək Münhendə türk, ingilis və rus dillərində nəşr etdirdikləri jurnaldır. Jurnal 1953-1954-cü illərdə adını dəyişərək Birləşik Qafqazya adı ilə dəyişərək dərc olunmağa davam etmişdir.

Jurnal aparılan tədqiqatlara nəzərən Almaniyanın Münhen şəhərində yerləşən Şimalı Qafqaz xalqlarının milli komitəsinin mətbu orqanı olduğu güman edilir (Demirci, 2019, s. 41-48).

**Tədqiqat**

Vahid konfederatif Qafqaz dövləti yaratmaq ideyasını açıq aydın təbliğ edildiyi jurnalın 1-ci sayındakı "Dava və qayəmiz" adlı baş məqaləsində bildirilirdi. "...Müztərib Vətənimizin qurtuluşu ümidi ilə yaşayan biz qafqazlılar üçün yalnız müstəqil və birləşik Qafqaz fikrinə sədaqətimizi yenidən bəyan etməklə qalmayıb, bu həddə hansı yollarla çatmaq istədiyimizi, hansı millətlərarası qüvvələrə istinad etməyi düşündüyümüzü, Qafqazın öz istiqlalım istirdad etməsi və xüsusilə onu mühafizə edə bilməsi üçün özünə hansı dostları və müttəfiqləri tapa biləcəyini də ortaya qoymaq zamanı gəlmişdir" (Qafqazya jurnalı, 1951, s. 4).

Jurnalda Qafqaz birliyi ideyasına, ərazidə yaşayan xalqların tarixi birliyinə, həmçinin çar Rusiyasının, sovet rejiminin Qafqazdakı siyasətinə dair elmi-publisistik materiallar dərc edilirdi. Əli xan Qantəmirin "Qafqaz" (1951, avqust, № l) Əhməd Nəbi Maqomanın "Qafqazın istiqlal mü-cadiləsi" (1951, avqust, № 1), Mirzə Bala Məmmədzadənin "Azərbaycanda ruslaşdırma siyasəti" (1952, iyun-iyul, № 11-12) və digər çoxsaylı məqalələrdə Qafqazın tarixi coğrafiyası, burada yaşayan xalqların adət-ənənəsi və yadellilərə qarşı birgə mübarizəsindən bəhs olunurdu (Azərbaycan Xalq Cumhuriyyəti ensklopediyası, 2005, s. 101-102).

Qafqazya jurnalının ən çox müraciət etdiyi mövzu sovet rejimi və ideologiyasının, bolşevizmin xalqlara gətirdiyi bəlaların tənqidi idi: Məhəmməd Əmin Rəsulzadənin "Azərbaycanda Aprel inqilabı" (1952, № 9), R. Trahonun "Şimali Qafqazda kollektivləşdirmə" (1952, № ll-12), M.H.Türkəqulun "Qızıl Rus imperiyası qan üzərində qurulmuşdur" (1952, № 14) məqalələri və s. Məhəmməd Əmin Rəsulzadənin "Qafqaz Konfederasiyası hərəkatı" (1951, № 2-3) və "Qafqaz məsələsi" (1952, № 14) məqalələri Qafqaz birliyi ideyasının proqramı adlandırıla bilər.

Mirzə Bala Məmmədzadənin "Milli istiqlal davamızın bugünkü səhifəsi" adlı yazısında (1952, avqust, № 13) bir tərəfdən rusların nəyin bahasına olursa-olsun, "Vahid və bölünməz Rusiya" qurmaq niyyətləri ifşa edilirsə, digər tərəfdən "milli istiqlal davamızı ruslarla bir bazarlıq mövzusu halına" gətirən qeyri-rus, o cümlədən Azərbaycan mühacirətinin yanlış mövqeləri tənqid olunur (Yaqublu, 2015).

"Hər şeydən öncə – milli istiqlal" adlı başqa bir məqaləsində (1952, oktyabr, № 15) M.B.Məmmədzadə Amerika Komitəsinin sədri admiral Kerki "Sovetlərdəki millətlərin istiqlal haqqını şübhə altına aldığına" görə qınayaraq yazırdı: "Bizim üçün, hər şeydən öncə, milli istiqlalımız bəhs mövzusu olduğu halda və müqəddəs haqqımızın qeyd və şərtsiz tanınmasını tələb etdiyimiz halda, Amerika Komitəsinin siyasətinə tərcüman olan admiral Kerk bunun tam əksini iddia edir, hətta daha irəli gedərək, "bir çox millətin qaynayıb-qarışıb tək bir millət" ola biləcəyini mümkün görür". Məqalədə daha sonra deyilirdi: "Hər şeydən öncə, istiqlal haqqının tanınmasını tələb edən millətlər yenidən böyük bir Rusiyanın təşəkkülünü ümumi barış, ümumi güvən, dünya mədəniyyəti və hürriyyət prinsipləri üçün böyük bir təhlükə hesab edirlər". "Qafqazya"nın tutduğu yolun doğru olduğunu tarix 40 il sonra təsdiq etdi: Sovetlər birliyi çökdü və imperiyanın xarabalıqları üzərində müstəqil milli dövlətlər yarandı.

"Qafqazya" 1953-cü ilin yanvarından həmin ilin mayınadək "Birləşik Qafqazya" (almanca Vereinigets Kaukasien – T. Ə.) adı ilə nəşr olunmuşdur. Proqram, məram, mövzu, problem və yazarlar baxımından "Birləşik Qafqazya" öz sələfindən fərqlənmirdi (Tahirli, 2003).

Qafqaz konfederasiyası ideyasına yarandığı vaxtdan tərəfdar olmayan erməni mühacirətinin təmsilçiləri, əvvəlki nəşrlər kimi, "Birləşik Qafqazya"nın da fəaliyyətində iştirak etmirdilər. Əsasən, Azərbaycan, Gürcüstan və Şimali Qafqaz nümayəndələrinin tribunasına çevrilən "Birləşik Qafqazya" Qafqaz konfederasiyası uğrunda ardıcıl mübarizə aparırdı. Jurnal eyni zamanda milli

istiqlal mübarizəsi önünə kötük kimi atılan "vahid və bölünməz Rusiya" prinsipinin tərəfdarlarına sərt cavablar verməyi də unutmurdu.

Azərbaycan mühacirətinin liderlərindən biri, görkəmli ideoloq M. B. Məmmədzadə beləl追inin tezislərini tutarlı tarixi faktlarla alt-üst edərək yazırdı: "Tarixən qılınc, qan və atəş gücü ilə, vəhşət və barbarlıqla təşəkkül etmiş Rusiya varsa, o millətlər zindanında... milli mövcudiyyətlərini qoruya biləcək qədər mədəni və insani qüdrət göstərmiş olan millətlər də vardır...".

Mürəkkəb və dəyişən tarixi şərait, ictimai-siyasi mühit mühacir istiqlalçıların mübarizə üsulu və taktikasında müəyyən dəyişikliklər etsə də, onları əsas prinsip, amal və proqramlarından döndərə bilməmişdi. Azərbaycan istiqlalçılarının "Birləşik Qafqazya"da dərc edilmiş bu qəbildən olan yazıları göstərir ki, sovet rejiminin "şiddət və təzyiq politikasına rəğmən, ruslar Azərbaycanı yalnız maddətən istila etməyə müvəffəq olmuş, Vətən mənən fəth edilməmişdir" (Türkəqul, 1953).

"Birləşik Qafqazya" Azərbaycan istiqlalçılarının həyatında və mətbuat tarixində parlaq iz qoymuş, "rədd olsun bölünməz və bütöv Rusiya, yaşasın Qafqaz Konfederasiyası, yaşasın millətlərin istiqlal haqqı!" – deyərək, SSRİ-dəki məhkum millətlərin istiqlalının bolşevizmə qarşı mübarizə proqramının tərkib hissəsinə çevrilməsində böyük rol oynamışdır (Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası, 1952, s. 101-102).

Quzey Qafqaz mühacirləri də parçalanmışdı. Əli xan Qandəmir, prof. Əhməd Nəbi Maqoma ilə birlikdə "Quzey Qafqaz Milli Komitəsi"ni yaradaraq, Münhendə "Birləşmiş Qafqazya" (rus, türk, ingilis dillərində) jurnalını yayınlayırdı. Əli xan Qəndəmir həm də "Prometey" tərəfdarı B. Baytuqan və B. Bilatti ilə təkrar canlanmış olan "Qafqaz" dərgisinin yazı işlərini idarə edirdi. Quzey Qafqazyalıların yeni mühacirlər qrupuna isə sabiq "Qazavat"ın yazı işləri müdiri Əbdurrəhman Avtorxanov başçılıq edirdi. Onun nəzarəti ilə "Svobodniy Kavkaz" jurnalı da nəşr olunurdu (Ə. Avtorxanov "Almaniya İslam Cəmiyyəti" adlı bir təşkilat da yaradıb, buraya xeyli mühacir müsəlman cəlb edə bilmişdi – T. Ə.).

Erməni, gürcü, tatar mühacirləri də bir neçə yerə bölünərək öz aralarında çarpışırdılar. M. Ə. Rəsulzadənin ətrafında birləşən əski Azərbaycan mühacirlərinə müharibənin gedişində "Azərbaycan Milli Birlik Məclisi" adı altında yaradılan yeni təşkilat müxalif mövqedə dayanırdı. Əbdurrəhman Fətəlibəyli Düdənginski bu təşkilatın rəhbəri, Azərbaycan parlamentinin 1919-cu ildə Parisə göndərdiyi diplomatik heyətin nümayəndələri, kifayət qədər mühacirət təcrübəsinə və nüfuza malik olan Ceyhun Hacıbəyli, Əkbərağa Şeyxülislam isə onun başqanlıq heyətinin üzvləri idi (İbrahimli, 2012, s. 174).

1951-ci ilin avqustunda Münxendə nəşrə başlayan «Qafqazya» jurnalı da elə ilk nömrəsindən əsas məqsədlərindən biri olan Qafqaz Birliyi ideyasına toxunmuşdu. Bu haqda danışılan məqalədə Qafqazın yenidən müstəqilliyə qovuşması yolları, onun mühafizə üsulları, kimlərin köməyindən istifadə ediləcəyi fikri öz əksini tapmışdı. Məqalə sanki əski "Prometey"çilər və onların tərəfdarları M.Ə.Rəsulzadə, Noy Jordaniya, Əli xan Qantəmirin birləşdiyi Rusiya Məhkumu Millətlərin Qurtuluş Birliyinin məqsəd və proqramından ibarət idi. Qonşularla münasibətdə isə tam müstəqil hüquqa sahib kimi əməkdaşlıq edilməsini ona görə məqalə müəllifi bu münasibətlərin daha çox Türkiyə, Rusiya, İran, Türkistan və ərəb ölkələri ilə qurulması vacib sayılır.

"Qafqazya"nın ümumi ab-havası Qafqaz Birliyi ideyasının gerçəkləşməsindən sonra əsl müstəqillikdən söhbət gedə biləcəyini söyləyir, Ərazidəki xalqların tarixən ortaq bir mübarizə yolu keçdiklərinə diqqət çəkir və çox zaman ümumi maraqlarına xidmət etdiklərini elmi faktlarla sübut edirdi.

"Qafqazya" jurnalı ayda bir dəfə, üç dildə – türk, rus, ingilis dillərində çıxırdı. Jurnal mövzuları əhatə etsə də, ən əsas Qafqaz Birliyi ilə bağlı yazılan yazıları qabarıq şəkildə verirdi. Demək olar ki, jurnalın hər sayında, hətta hər yazısında rus bolşevizminə, kommunizmə, rus islahatlarına nifrət duyulan hiss olunurdu. Jurnalda təkcə azərbaycan mühacirləri deyil, eyni zamanda digər mühacir qrupların Qafqaz Birliyi haqqında fikirlərinə də yer verilirdi. Rus mühacirləri də jurnalda Qafqazın gələcək taleyi ilə bağlı münasibətlərini bildirirdilər. Rus mühacirlərinin bir qrupu isə Qafqaz Birliyi ideyasına qarşı sərt mövqedən çıxış edərək, Rusiyanın "bütöv və bölməzliyini" müdafiə edir, Azərbaycan Milli Birliyinə dəstək verən və ona maliyyə yardımı göstərən Amerika Komitəsinin fəaliyyətini qətiyyətlə pisləyir. Bir qrup rusiyalı miqrant yalnız Rusiya tərəfi üçün vuruşduqlarını,

başqa variantla razılaşmadıqlarını bildiriblər. Bəzi rus mühacir təşkilatları (məsələn, Xalq Azadlığı Uğrunda Mübarizə Cəmiyyəti) təşkilati idarəetmə altında yaşayan xalqların öz müttəfiqlərini təyin etmək hüququnu tanısalar da, "vahid Rusiya" ideyasından əl çəkmədilər. Onlar dolayısı ilə bu fikri dəstəklədiklərini bildiriblər.

Azərbaycan mühacirləri "Qafqaz" jurnalının səhifələrində bu rusların fikirlərinə sərt cavablar verir, tarixi və elmi izahlarla susdurmağa çalışırlar. Eyni zamanda M. Ə. Rəsulzadə rusların demək olar ki, bütün yazılarını təhlil edir və bu yazıların arxasında nələrin gizləndiyini göstərirdi.

Qafqaz Birliyi ideyalarını dəstəkləyənlərdən biri də azərbaycanlı mühacirlərin fəal üzvü olan N. Şeyxzamandır, bu barədə "Qafaqaziya" jurnalında dərc olunan məqalələrdə qeyd olunur. Nair Şeyxzamandan fərqli olaraq M. B. Məmmədzadə Qafqaz xalqlarının "əriyib bir millətə çevrilməsi" ideyasını qeyri-mümkün bir vəziyyət kimi qiymətləndirmiş və hər bir xalqın öz müstəqilliyini əldə etməsinə daha böyük üstünlüklər vermişdir (Məmmədli, 2006, s. 15-16).

Jurnalda Qafqazın 1917-1920-ci illər tarixində dövlət orqanlarında mühüm fəaliyyətləri ilə yadda qalan siyasi xadimləri birləşmiş regionun mühüm problemlərinin çözülməsi istiqamətində fəaliyyətlər göstərir, yazılarını dərc edirdilər. Birinci nömrədə A. Magomanın "Qafqazya"nın İstiqlal Mücadiləsi" adlı məqaləsində "Qafqaz Birliyi" ideyasından bəhs olunarkən 1920-ci il istilasından sonra Qafqazlılar arasında böyük rəğbət qazanan bu fikrə bütün məsum millətlər çiyin-çiyinə gedirdilər. Jurnalın 2-ci sayında Qafqaz Konfederasiyasının xəritəsi ilk səhifədə verilmiş M.Ə.Rəsulzadə isə, "Qafqazya konfederasiyon haraketi", 1952-ci ildə isə davamlı olaraq bir birninin ardınca 6, 7, 8, 9, 10, 11-12, 14-cü saylarında "Qafqazya məsələsi", 17-ci nömrədə isə "Ümum Qafqazya siyasətinin ana xəttləri" adlı məqalələrində Qafqaz birliyi ideyasının məqsəd və vəzifələrindən birləşmə prinsiplərindən bəhs olunurdu (Qafqaziya jurnalı, № 17, 1952, s. 4). "Qafqaz birliyi məsələsi" 6-ci nömrənin ilk səhifələrində başlıq şəkildə verilmişdir. Birinci səhifədə "Qafqaz Cümhuriyyətlərinin istiqlalı" adlı məqalədə yenidən istiqlal yolunun "Qafqaz Konfederasiyası damı altında birləşməkdən keçdiyini bildirir. Jurnalın 17-ci nömrəsində Qafqaz Konferansı və Ümum Qafqaz Konferansının bəyannaməsi dərc olunmuşdur ki, 11-16 noyabr 1952-ci ildə Almaniyanın "Habis" otelində keçirilən ÜmumQafqazya Konfransının nəticələri, bəyanna-məsi və bundan sonra alacaq şəkili haqqında kifayət qədər geniş faktlar dərc olunmuşdur.

1950-1955-ci illərdə Almaniyada yaşayan mühacirlərin də Qafqaz Birliyi ideyasının ən aktual olduğu bir dövrdə nəşr olunan bu jurnal sanki qafqazlıların siyasi xadimlər tərəfindən illər öncə bəyan edilmiş və reallaşması uğrunda mübarizə aparılan bir cəmiyyətin "Qafqaz Birliyi" ideyasının bütün qafqazlılara çatdırılması üçün böyük rol oynarırdı (Yaqublu, 2015).

Gürcülər Qafqaz birliyinə bir qədər fərqli prizmadan yanaşmışlar. Daha doğrusu, Qafqaz üçün çətin dövr başlayanda gürcü siyasətçiləri birlik ideyasını yada salmış və onun gerçəkləşməsinə çalışmışlar, lakin stabillik bərqərar olanda bu ideya da yaddan çıxmışdır. Gürcüstanın mövcud ideyaya soyuq baxışlarına səbəb olan amillərdən biri də din amilidir. Ermənilərsiz tək xristian məmləkəti kimi ancaq müsəlmanlardan ibarət olan Qafqaz Birliyinə daxil olmaq psixoloji baxımdan gürcülər üçün elə də asan qəbul edilən məsələ olmamışdır.

## Nəticə

1950-1955-ci illərdə Almaniyada yaşayan mühacirlər üçün Qafqaz Birliyi ideyasının ən aktual olduğu bir dövrdə nəşr olunan bu jurnal sanki qafqazlıların siyasi xadimlər tərəfindən illər öncə bəyan edilmiş və reallaşması uğrunda mübarizə aparılan bir cəmiyyətin "Qafqaz Birliyi" ideyasının bütün qafqazlılara çatdırılması üçün böyük rol oynarırdı.

Gürcülər Qafqaz birliyinə bir qədər fərqli prizmadan yanaşmışlar. Daha doğrusu, Qafqaz üçün çətin dövr başlayanda gürcü siyasətçiləri birlik ideyasını yada salmış və onun gerçəkləşməsinə çalışmışlar, lakin stabillik bərqərar olanda bu ideya da yaddan çıxmışdır. Gürcüstanın mövcud ideyaya soyuq baxışlarına səbəb olan amillərdən biri də din amilidir. Ermənilərsiz tək xristian məmləkəti kimi ancaq müsəlmanlardan ibarət olan Qafqaz Birliyinə daxil olmaq psixoloji baxımdan gürcülər üçün elə də asan qəbul edilən məsələ olmamışdır.

## Ədəbiyyat

1. *Azərbaycan Xalq Cumhuriyyəti ensklopediyası*. (2005). II cild. Lider nəşriyyatı.
2. Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. (2005). 2 cilddə. II cild. *Qafqaz (jurnalı)*, 101-102, 472.
3. Caferoğlu, A. (1963, sentyabr). *İmmiqrasiyadan Mövzular*. Türk Mühacir və Qaçqın Dərnəkləri Yayınları Federasiyası.
4. Demirci, S. (2019). Qafqazya (Der Kaukasus) jurnalı və Azərbaycan Miqrasiyasının Şimali Qafqaz Milli (İstiqlal) Komitəsinin nəşr orqanı. *Qafqazşünasların II Beynəlxalq Forumu*, 23-24 may, 1-ci kitab, 41-48.
5. İbrahimli, X. (2012). *Siyasi Mühacirət tarixi*.
6. *Qafqazia jurnalı*, 17. (1952).
7. Məmmədli, C. (2006). *Mühacirət mətbuatında Qafqaz Birliyi ideyası*. Xəzər xəbər, 220, 15,12, 15-16.
8. Səbəbimiz və Səbəbimiz. (1951). *Qafqazya jurnalı*, 1.
9. Türkəqul, M. (1953, may). *Azərbaycan türklərinin istiqlal günü*, 5.
10. Tahirli, A. (2001). *Azərbaycan mühacirəti*. *Azərbaycan mühacirət mətbuatı*. II hissə.
11. Yaqublu, N. (2015). *Məmməd Əmin Rəsulzadə Ensklopediyası*. Azerbaycan Kültür Derneği Yayınları.
12. Yaqublu, N. (2011). *Azərbaycan Muhacirət irsi*. Elm-təhsil nəşriyyatı.

Daxil oldu: 17.08.2024
Baxışa göndərildi: 21.09.2024
Təsdiq edildi: 30.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/31-37

**Nazim İsmayılov**
Bakı Musiqi Akademiyası
fəlsəfə üzrə fəlsəfə doktoru
ism.nazim@mail.ru
**Sevda Yusifova**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
sevda.yusifova@hotmail.com

## “Multikulturalizm”, “avrosentrizm” və “avropaçılıq”

**Xülasə**

Azərbaycanda multikultural dəyərlərə hörmət edilməsi dövlət siyasətimizin prioritet istiqamətlərindən birini təşkil edir. Bu gün multikulturalizm probleminə marağın artması bütün dünyada olduğu kimi, bizim ölkəmizdə də müşahidə olunur ki, bu da bir tərəfdən cəmiyyət daxilində həyatın bütün sahələrində baş verən müxtəlif fərqlərin azalması deyil, əksinə, bu meyillərin aydın şəkildə artması ilə bağlıdır. Digər tərəfdən isə multikulturalizm probleminə çox yaxından təsir göstərən miqrasiya problemidir. Bu gün bütün dünyanı öz ağuşuna almış miqrasiya probleminin kökündə yerli xalqlarla gəlmə xalqların nümayəndələri arasında yaranan mədəni, dini və həyat fəaliyyətinin bütün digər mühüm sahələri arasınnda yaranan qarşıdurmalar ilə bağlıdır.

Digər mədəni təcrübələrin qavranılması, mənimsənilməsi və özünə uyğunlaşdırılması yeni mədəni formaların yaranması və inkişafı üçün bir növ stimul rolunu oynayır. Bir qayda olaraq, yeni kommunikasiya texnologiyaları sayəsində yerli mədəniyyətlər arasında qarşılıqlı mübadilə proseslərinin intensivləşməsi və sürətlənməsi informasiyanın emalını və seçilməsini, onun dərk edilməsini, sistemləşdirilməsini və “özününkiləşdirilməsini” çətinləşdirir. Digər tərəfdən, müasir dövrdə qloballaşan dünyada getdikcə strukturlaşdırılmamış xarici mədəniyyətin, onu qəbul edən milli mədəniyyətdə həcminin artması şəraitində, xarici mədəniyyət tərəfindən yerli mədəniyyətin “xüsusi”, “fərdi dəsti-xətti”ni öz axınında əritmək, həll etmək ehtimalı, təhlükəsi, əlbəttə ki, çox böyükdür.

Məqalədə multikulturalizm probleminə “avrosentrizm” və “avropaçılığ”ın təsir dairəsi də öz əksini tapıb.

***Açar sözlər:*** *multikultural cəmiyyət, assimilyasiya, inteqrasiya, qloballaşma, mədəniyyətlərarası dialoq, avrosentrizm, avropaçılıq*

**Nazim Ismayilov**
Baku Academy of Music
Doctor of Philosophy in Philosophy
ism.nazim@mail.ru
**Sevda Yusifova**
Azerbaijan State Oil and Industry University
sevda.yusifova@xotmail.com

## "Multiculturalism", "Eurocentrism" and "Europeanism"

**Abstract**

Respecting multicultural values in Azerbaijan is one of the priority areas of our state policy. Today, the increase of interest in the problem of multiculturalism is observed in our country as well as in the whole world, which is not a decrease of various differences occurring in all spheres of life within the society, but on the contrary, it is related to a clear increase of these tendencies. On the other hand, it is the problem of migration that closely affects the problem of multiculturalism. Today, the root of the migration problem, which has gripped the whole world, is related to the

conflicts between the indigenous peoples and the representatives of the new peoples in the cultural, religious and all other important areas of life.

Perception, assimilation and adaptation of other cultural practices serve as a kind of stimulus for the emergence and development of new cultural forms. As a rule, the intensification and acceleration of the processes of mutual exchange between local cultures due to new communication technologies complicates the processing and selection of information, its understanding, systematization and "owning". On the other hand, in the modern globalized world, in the conditions of increasing volume of unstructured foreign culture in the national culture that receives it, the possibility and danger of melting and dissolving the "special" and "individual features" of the local culture by the foreign culture is of course very high it is big.

The influence of "eurocentrism" and "europeanism" on the problem of multiculturalism is also reflected in the article.

***Keywords:*** *multicultural society, assimilation, integration, globalization, intercultural dialogue, eurocentrism, europeanism*

## Giriş

Multikulturalizm bir siyasi cərəyan və inkişaf modeli kimi XX əsrin 2-ci yarısında öz tərkibinə görə müxtəlif tərkibli, yekcins olmayan immiqrasiyanın yeni dalğasından, Yeni Dünyanın yerli xalqlarının və Amerika qaradərililərinin özünütəsdiq və özünüdərk proseslərinin artması, həmçinin ABŞ-da feminizm hərəkatı və s. təsirləri sayəsində yaranmışdır və o dövr Kanada və Avstraliya multikultural siyasət institutları açıq və qeyd-şərtsiz, ABŞ və Qərbi Avropa isə onu yalnız dolayı və qismən qəbul etmişdir. Müasir dövrdə multikultural cəmiyyətlər və hərəkatlar hazırda mədəni identikliyin mənası və mədəniyyətlərin fəaliyyəti, siyasi həyatın adekvat qurulması, mövcud olanın qorunub saxlanılması və mövcud dəyişikliklərin qorunması problemləri ilə məşğul olan Qərbin ənənəvi siyasi fəlsəfəsinə, sosial nəzəriyyəsinə və siyasi ideologiyasına ciddi çağırış kimi çıxış edir ki, bunların da bəziləri artıq geniş müzakirə obyektinə çevrilmişdir (Azərbaycançılıq ideologiyası: ənənə və müasirlik, 2019).

**Tədqiqat**

**Tədqiqat işinin məqsədi**

Müasir dövrümüzdə multikulturalizm probleminə marağın artması (onun nəzəri və ya empirik olmasından asılı olmayaraq) onunla bağlıdır ki, cəmiyyətdə mədəni fərqlər nəinki yox olmur və ya azalmır, əksinə, bu meyillər aydın şəkildə artır və bu fakt iki hadisənin inkişaf dinamikası ilə sıx surətdə bağlıdır:

1. İlk növbədə, söhbət XX əsrin ikinci yarısında yeni immiqrasiya dalğasından gedir. Kanada və Avstraliyaya ingilis olmayanların immiqrasiyası birincinin bikulturalizmini, ikincinin isə Britaniya-Avropa monokulturalizmini sual altına qoyur. Müasir dövrdə isə multikulturalizmlə bağlı problemlər ilk növbədə Qərbi Avropanın inkişaf etmiş ölkələrində yaşayan miqrantların çoxluğu və bununla bağlı bu ölkələr qarşısında duran və bu ölkə rəhbərləri tərəfindən həll edilə bilinməyən problemlərin çoxluğu ilə əlaqədardır (İsmayılov, Yusifova, 2016).

2. Multikulturalizmin bərqərar olması üçün ikinci yol ABŞ-nin mərkəzi rol oynadığı mədəni kimlik siyasəti vasitəsilə həyata keçmişdir. Başlanğıcını 1960-cı illərin ikinci yarısından götürən bu prosesin əsasını formalaşmış stereotiplərə və institutlara meydan oxuyan tələbə və gənclər hərəkatları qoymuşdur. ABŞ-də bu hərəkatlar lap əvvəldən güclü anti-irqçi məzmuna malik idi ki, bu da əsasən qaradərililərin öz hüquqları uğrunda apardıqları mübarizə ilə bağlı idi. Lakin dərisinin rəngindən asılı olmayaraq şəxsiyyətin inteqrasiya və bərabər fərdi hüquqlara malik olmasına doğru yönəlmiş mədəni kimlik siyasətinin məqsədi, vətəndaş hüquqları uğrunda aparılan mübarizənin nə bir hissəsi, nə də qanuni mirası idi – yəni bu daha çox, institusional bərabərlik uğrunda gedən mübarizənin nəticəsi idi. Əvvəllər ayrı-seçkiliyə məruz qalmış, təcrid olunmuş və xor baxılan etnik qruplar arasında; köçkünlər tərəfindən yaradılmış ölkələrin yerli əhalisi arasında öz mədəniyyətləri ilə qürur hissi ifadə edən hərəkatlar daha çox yayılmağa başlamışdır (məsələn: Kanada və Avstraliyada).

"Multikultur", "multikulturalizm", "multikultural cəmiyyətlər" – qədim mənşəli sözlərin son zamanlar müəyyən edilmiş yeni ifadələridir – yəni hazırda multikultural adlanan cəmiyyətlər əvvəllər "çoxmillətli" və ya "multietnik", "çoxkonfessiyalı" və ya "multidini", "çoxirqli" və ya "multiirqi" adlanırdı. Onlar "mədəni plüralizm", "mədəni fərqliliklər" və "metisizasiya" (Latın Amerikası) təzahürləri kimi qəbul edilirdi. "Multikulturalizm" termininin özü o zaman Kanadadakı gərgin vəziyyəti həll etmək və o zamankı bikultural (İngilis-Fransız) ölkəni idarə etmək yollarının axtarışı zamanı yaranmışdır (İsmayılov, Yusifova, 2016).

"Multikultural cəmiyyət", "multikulturalizm" anlayışları XX əsrin 60-cı illərində Kanadada ölkə əhalisinin etnik-mədəni, irqi, dini, xüsusilə də lingvistik müxtəlifliyinin vəziyyətini göstərmək üçün yaranmışdır və "multikulturalizm"in dövlət səviyyəsində tanınması, ölkənin mədəni cəhətdən müxtəlif əhalisini homogenləşdirməyə (yunanca "homos" – eyni xüsusiyyətlərə, oxşar şeyə sahib olmaq) yönəlmiş assimilyasiya siyasətinin mənasızlığının dövlət qurumları tərəfindən bir növ etiraf aktı kimi, 1971-ci ildə rəsmi bir dövlət siyasəti kimi qəbul edilmişdir.

Multikulturalizm modelinin əsl mahiyyətini yığcam şəkildə "assimilyasiya olmadan inteqrasiya" formulu ilə ifadə etmək olar ki, bu da digər mədəni müxtəlifliklərin legitimləşdirilməsini – yəni bir dövlətin hüdudları daxilində müxtəlif etnik-mədəni, konfessional və s. ictimai təmsilçilik hüququna malik olan və öz xüsusi cizgilərini, mədəni xüsusiyyətlərin diktə etdiyi həyat tərzini qorumaq hüququna malik olan birləşmələrin mövcud olduğunu nəzərdə tutur. Multikulturalizm həm də sosial mexanizmlər vasitəsilə multikultural mozaikaya nəzarət və tənzimləmə üsuludur. O, sosiomun etnomədəni fraqmentasiyası fenomeninə bənzəyir ki, bu da "çoxmədəniyyətlilik"lə sinonimdir (İsmayılov, Yusifova, 2017).

Multikulturalizm təkcə mədəni fərqlərin mövcudluğunun cəmiyyətdə (dövlətdə) təsbit və tanınması anı deyil. Bu gün multikulturalizm artıq bütün dünyada həm də bir ideologiya və siyasət modeli kimi başa düşülür və qəbul edilir və ona görə də multikulturalizmin dərk edilməsində siyasi və ideoloji məqama xüsusi diqqət yetirmək çox vacibdir. Bir ideologiya və siyasət modeli kimi multikulturalizm ilk növbədə ümummilli dəyərlərin milli üzərində qurulmasını nəzərdə tutur. Multikulturalizm siyasət kimi – multikulturalizm prinsiplərinin praktiki tətbiqinə yönəlmiş, mədəni, milli və s. azlıqların hüquqlarının nəzərə alınması, onlara sosial dəstək proqramlarının həyata keçirilməsidir; dövlətlə onun tərkib hissəsi olan etnik, mədəni azlıqlar arasında münasibətlərin uyğunlaşdırılmasına, habelə bu azlıqlar daxilində münasibətlərin tənzimlənməsinə yönəlmiş bir siyasi proqramdır. Demoqrafik nöqteyi-nəzərdən isə multikulturalizm immiqrantları qəbul edən cəmiyyətə inteqrasiya etmək siyasəti kimi başa düşülür ki, onun da əsasında miqrasiya və immiqrasiya amillərinin təsiri altında milli cəmiyyətlərin demoqrafik, etnomədəni parametrlərinin dəyişilməsi durur (Həbibbəyli, 2017).

Postmodern dövrün mədəni vəziyyətini qismən özündə əks etdirən multikulturalizm, onun əsas dəyər prinsipləri ilə də son dərəcə həmahəngdir. Qərbi Avropa sivilizasiyasının inkişafının neoliberal mərhələsi etnorasional və mədəni polisentrizmin yaranmasına səbəb olmuşdur. Polietnik ölkələrdə əhalisinin çoxmillətli olması səbəbindən hökumət təkcə miqrantlar haqqında deyil, həm də ölkədə uzun müddət yaşayan azsaylı xalqlar haqqında da düşünməyə məcburdur. Multikultural inteqrasiya modelinin dövlət tərəfindən qəbul edilməsi o deməkdir ki, o, başqa etnik mənsubiyyətdən olan miqrantlar üçün açıqdır və o onların inteqrasiyası üçün şərait yaratmaq üçün məsuliyyət daşıyır və məhz buna görə də, multikultural cəmiyyətdə yerli əhali ilə gəlmə miqrantlar arasında münaqişəli vəziyyətlərin həllində, ölkədə ictimai-siyasi vəziyyəti yaxşılaşdırmaq və s. üçün toplanmış təcrübəni təhlil edərək, problemin həlli yollarını göstərmək və tətbiq etmək çox vacibdir. Multikulturalizm ideyaları əksər Avropa ölkələrində ilk növbədə bu ölkələrdə yaşayan miqrantların çoxluğu və onların həyat fəaliyyətləri ilə bağlıdır (Azərbaycançılıq ideologiyası: ənənə və müasirlik, 2019). XXI əsrin reallağı ondan ibarətdir ki, bu gün multikulturalizm dövlətlə onu təşkil edən etnik və mədəni azlıqlar arasında münasibətlərin uyğunlaşdırılmasına, habelə bu azlıqlar daxilində münasibətlərin tənzimlənməsinə yönəlmiş bir siyasi proqram olmalıdır və bu nöqteyi-nəzərdən Bakıda 2024-cü ilin mart ayının əvvəlində "Müxtəlifliyin qorunması: 2024-cü ildə İslamofobiya ilə mübarizə" mövzusunda keçirilmiş beynəlxalq konfransın çox böyük əhəmiyyəti vardır. İslamofobiya ilə Beynəlxalq Mübarizə Gününə (2022-ci ildən hər il martın 15-də geyd edilir) həsr

olunan Bakı konfransında (Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi, Beynəlxalq Münasibətlərin Təhlili Mərkəzi, G20 Dinlərarası Dialoq Forumu və Bakı Təşəbbüs Qrupunun birgə təşkilatçılığı ilə reallaşdırılıb) dünyanın 30 ölkəsindən iştirak edən beynəlxalq təşkilatların ekspertləri, alimlər, din xadimləri və qeyri-hökumət təşkilatlarının nümayəndələri beynəlxalq səviyyədə islamofobiyaya qarşı mübarizə kontekstində qarşıda duran məsələləri müzakirə etmişdilər. Artıq Bakıda ikinci dəfə keçirilən konfransda geyd edildiyi kimi, müasir dövrdə ayrı-seçkilik, islamofobiya, diskriminasiya, nifrət hissi artıq günümüzün real gerçəkliyinə şevrilmişdir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin beynəlxalq konfransın iştirakçılarına müraciətində qeyd etdiyi kimi: "Acınacaqlı haldır ki, hazırda islamofobiya özünü demokratik hesab edən bir sıra Qərb ölkələrinin dövlət siyasətinin tərkib hissəsini təşkil edir. Son bir ildə dünyada baş vermiş bütün anti-İslam təzahürlərinin 80 faizi bu ölkələrin payına düşür... Əminəm ki, konfrans islamofobiyaya qarşı birgə səylərlə mübarizəyə, dinlərin və inancların müxtəlifliyinə hörmətə əsaslanan tolerantlıq və sülh mədəniyyətinin təşviqi ilə bağlı yeni təşəbbüslərin irəli sürülməsinə töhfə verəcəkdir" (Müxtəlifliyin qorunması. 2024-cü ildə İslamofobiya ilə mübarizə", 2024).

Qərb ölkələrindən fərqli olaraq, Azərbaycanda multikulturalizmin çox qədim kökləri vardır və müasir dövrdə "Azərbaycan multikulturalizmi" özünün özünəməxsusluğu və dayanıqlığı ilə bütün dünyada məşhurdur. Azərbaycan bir çox mədəniyyətlərin vahid mədəni məkanda azad və xöşbəxt sürətdə birgə mövcudluğunun müstəsna nümunələrindən biridir. Çoxmillətli və çoxkonfessiyalı ölkə olan Azərbaycanda bütün dinlərin və etnik qrupların nümayəndələri bu gün dini bərabərlik və inklüzivlik şəraitində mehriban bir ailə kimi əmin-amanlıq şəraitində yaşayır (Azərbaycan multikulturalizminin elmi-fəlsəfi və ictimai-publisistik qaynaqları: II kitab, 2021).

Azərbaycanda multikulturalizm fenomeninə marağın artması XX əsrin 90-cı illərində Azərbaycanda və dünyanın digər yerlərində baş verən hadisələrlə sıx surətdə bağlı idi ki, bu da "sovet kimliyi"nin monolit birliyini əhəmiyyətli dərəcədə sarsıdan xalqların etnik özünüdərk etməsi prosesinin yüksəlişi ilə bağlı idi. Bu gün multikulturalizm təkcə cəmiyyətdə mədəni fərqliliklərin mövcudluğunun təsbiti və tanınması anı deyil, o həm də insanların həyatında hüquqi normalarda, ictimai institutlarda və gündəlik həyatda öz ifadəsini tapan siyasi fəlsəfə və etik davranışlar sahəsindəki konseptual bir mövqedir (Niftiyev, 2015, s. 408).

Bu gün etnik, milli, mədəni müxtəliflik deyəndə – qapalı iyerarxiyadan, strukturdan sistemdə komponentlərin daha mürəkkəb birləşmə üsullarını ehtiva edən digər konfiqurasiyaların yaradılmasına doğru hərəkət nəzərdə tutulur. "Mədəniyyətdə şaquli xəttin" dağılmasının, avrosentrizmin böhranının şahidi olan XX əsrin sonları artıq post-müstəmləkəçilik, daha sonra isə qloballaşma şəraitində mədəniyyətlərin qarşılıqlı təsiri artıq qaçılmaz bir fakt idi və belə bir şəraitdə mədəniyyətlərin dialoqu problemi nəzəri anlaşma sahəsindən praktik həll sahəsinə keçmişdir. Lakin son illərdə Avropa ölkələrindəki sosial-iqtisadi vəziyyət, işsizlik etnik münasibətlərin inkişafı üçün o qədər də əlverişli mühit yaratmır (Tolerantlıq və multikulturalizm: beynəlxalq sənədlər toplusu, 2017, s. 156).

Multikulturalizm problemləri həm də cəmiyyətdə vətəndaş cəmiyyəti quruculuğu prosesi ilə əlaqədardır ki, bu da ayrı-ayrı vətəndaşların, etnik qrupların və bütün növ qrupların bir-birinə qarşı tolerant münasibəti, onların razılığa gəlmək bacarıqlarının, qarşılıqlı maraqları olmadan təsəvvür belə edilə bilməz və bu gün bunun üçün təkcə dövlət deyil, həm də bütövlükdə cəmiyyətə birbaşa təsir göstərən bir çox ictimai təşkilatlar da məsuliyyət daşıyır. Məntiqlə yanaşsaq, bütövlükdə multikulturalizm ölkədə tolerant siyasi mədəniyyətin formalaşmasına töhfə verməlidir (Niftiyev, 2017, s. 248).

Son illərdə multikulturalizmin tez-tez kəskin tənqid olunması bir daha onu sübut edir ki, elm adamlarının və siyasətçilərin arasında bu fenomenə maraq heç də azalmayıb. Bu məsələnin aktuallaşmasının səbəbləri içərisində mədəni plüralizm, multikultural cəmiyyət, xüsusən də bəzi ölkələrdən davamlı miqrasiya axını, digərlərinin isə yürütdüyü qeyri-müəyyən miqrasiya siyasəti, habelə bəzi ölkələr arasında yeni münaqişəli vəziyyətlərin yaranması, bəzi böyük dövlət rəhbərlərinin yürütdükləri səhv siyasəti və s. göstərmək olar (müəlliflərin bu məsələlərə münasibəti onların əvvəlki dövrdə yazdıqları məqalələrdə öz əksini tapıb. Bax: 2. MAR. 04 iyun 2016, s. 66-

71; 3. MER. 13-14 oktyabr 2016, s.116-118; 4. TMA, 2017, s.91-94; 5. M-TP. № 3 (August), 2017, p. 56-57.)

Multikulturalizmin formalaşması uzun müddətli bir prosesdir və onun mövcud olmadığı ölkələrdə, bu perspektiv inkişafı nəzərdə tutan bir siyasətdir və məhz buna görə də o, dərhal və nəzərəçarpacaq dərəcədə müsbət nəticələr verə bilməz. Ona görə də post-müstəmləkəçilik dövründə Qərbi Avropanın milli dövlətləri üçün mədəni irsin qorunması, tarixi yaddaşın, etnik-mədəni özünəməxsusluğun qorunub saxlanması problemi bu gün əsas problemlərdən birinə çevrilib. Multikulturalizm təkcə etnik eynilikləri deyil, o, həm də müxtəlif həyat tərzini, oriyentasiya və mədəni cərəyanları da özündə ehtiva edir. Bu nöqteyi-nəzərdən biz Azərbaycanı fəxrlə misal çəkə bilərik və prezidentimizin geyd etdiyi kimi, çoxmillətli və çoxkonfessiyalı ölkə olan Azərbaycanda "...bütün dinlərin və etnik qrupların nümayəndələri əmin-amanlıq şəraitində bir ailə kimi yaşayırlar. Ölkəmizdə milli sərvət kimi qorunan dini bərabərlik və inklüzivlik Azərbaycan xalqının həyat tərzidir, onun güc mənbəyidir. Bundan irəli gələrək, təbiidir ki, multikultural dəyərlərə hörmət bizim dövlət siyasətimizin prioritet istiqamətlərindən birini təşkil edir" ("Müxtəlifliyin qorunması. 2024-cü ildə İslamofobiya ilə mübarizə", 2024).

Bir halda ki, mədəni plüralizm etnik eyniliklərin qapalı həyat sürməsində, qapalı mövcudluğunda deyil, onların qarşılıqlı təsirindən ibarətdir, o zaman mədəni plüralizm siyasəti təkcə etnolinqvistik və etnokonfessional qruplar arasında "dialoqun" təşviqinə deyil, həm də ümumi kommunikasiya məkanının formalaşmasına yönəlib ki, bu da öz təbiətinə görə hər hansı bir etnik başlanğıcdan daha yüksək və üstündür.

Etiraf etmək lazımdır ki, multikulturalizm mədəniyyət modeli kimi dərin lokal xüsusiyyətlərə malikdir və o, onu doğuran mədəniyyətin inkişafının tarixi xüsusiyyətlərini özündə əks etdirir. Müasir multikultural vəziyyət ona görə unikaldır ki, bu – dünyagörüşün, dünyaya münasibətin, onu dərk etmənin yeni rakurslarının, perspektivlərinin formalaşdığı yaradıcı situasiyasıdır.

Başqa, digər bir mədəni təcrübənin dərk edilərək qavranılması, qəbul edilərək mənimsənilməsi və ya ona uyğunlaşması, məlum olduğu kimi, yeni mədəni formaların yaranması üçün bir stimul rolunu oynayır. Lakin burada təhlükə doğura bilən məqamlardan biri ondan ibarətdir ki, bir qayda olaraq, yeni kommunikasiya texnologiyaları sayəsində yerli mədəniyyətlər arasında mübadilə proseslərinin intensivləşməsi və sürətlənməsi, məlumatın qısa zaman kəsiyində işlənməsi, seçilməsi və dərk edilməsi, onun sistemləşdirilməsi və s., digər mədəniyyətin "özününkiləşdirilməsi" anını çox zaman çətinləşdirir. Digər tətəfdən, strukturlaşdırılmamış xarici mədəni təcrübənin çox böyük həcmi öz axınında yerli mədəniyyətin "xüsusi", "fərdi xüsusiyyətlərini" özündə "həll etmək", "əritmək" təhlükəsi ilə müşahidə oluna bilər ki, bu ehtimal da çox böyükdür. Buna görə də qloballaşan dünyada yerli mədəniyyətlərin dialoquna doğru hərəkət çox vaxt öz mədəni prinsiplərinin qorunub saxlanması narahatlığı ilə müşayiət olunur ki, bu da çox vaxt onların öz həyat qabiliyyətlərinə inamsızlıqlarından xəbər verir (Abdullabekov, Multikulturalizm – vajniy aspekt tolerantnosti).

XX əsrin sonu – XXI əsrin əvvəllərində Azərbaycan milli kimliyinin, milli-mənəvi dəyərlərin inkişafında iki meyl özünü aydın surətdə büruzə verir: 1. Qərbi Avropa, ABŞ mədəniyyətinin və sivilizasiyasının bütünlüklə surətini (kopiyasını) çıxarmaq və yerdə təkrar istehsal etmək, 2. digəri isə Qərb mədəniyyətinin məziyyətlərini inkar etmədən milli köklərə, adət-ənənələrə daha diqqətli münasibəti əldə rəhbər tutmaq. Çünki onsuz heç bir xalq inkişaf edə bilməz. Burada əsas məsələ ikinciyə əsaslanaraq, onun özülü üzərində birincinin mütərəqqi keyfiyyətlərini öz həyat və fəaliyyətlərimizdə yaradıcı surətdə istifadə etməyi bacarmaqdır.

Qərbin müasir "mədəni" modeli insanı Qərb praqmatik modelinə yönəldir, yəni – insanı hazır maddi istehlaka (sərf etməyə, işlətməyə) kökləyir, ideal dəyər komponentləri isə itirilir. Nəticədə biz sosial münasibətlərin marginallaşmasını müşahidə edirik; burada insan yaradıcı və ahəngdar inkişaf etmiş insan əvəzinə, uyğunlaşmış, öyrəşmiş, vərdiş etmiş insana çevrilir. Bu gün gənclərdə milli mənlik şüurunun, özünəməxsusluğun formalaşdırılması, onlarda vətənpərvərlik ruhunun yüksəldilməsi və s. cəmiyyətin qarşısında duran əsas problemlərdən biri kimi insanları çox narahat edir. Əsas sual isə – bəs bunu "avrosentrizm" şəraitində "etmək olarmı"dır?

Bu suala cavab vermək üçün ilk növbədə "multikulturalizm", "avrosentrizm" və "avropaçılıq" anlayışlarına aydınlıq gətirmək lazımdır. Multikulturalizmin mahiyyəti ilə bağlı problemə məqalə müəllifləri bu məqalənin əvvəlində və mövzu ilə bağlı yazdıqları əvvəlki məqalələrində öz mövgelərini bildiriblər. Bəs "avrosentrizm" və "avropaçılıq"ın əsas mahiyyəti nədir ?

Müasir dövrümüzdə multikultural cəmiyyətdə "avropaçılıq"ın təsiri altında insanların həyat fəaliyyətlərinin bütün sahələrində xarici mədəniyyətlərin təsirini nəzərə almadan inkişaf etmək əlbəttə ki, qeyri mümkündür. Azərbaycan və Avropa xalqlarının tarixinin fərqli köklərə malik olmasına baxmayaraq, Azərbaycan əsrlər boyu Avropadan kifayət qədər mütərəqqi şeyləri mənimsəmişdir. Lakin onu da geyd etmək lazımdır ki, bu təsir heç də birtərəfli olmamışdır.

Burada bir cəhət maraq doğurur – avropaçılıq termininin izahına keçməzdən əvvəl aydınlaşdıraq – nə üçün bir çox qeyri-avropa cəmiyyətləri Qərbi Avropa dəyərlərinə istiqamətlənir? Biz onları müasir reallığımızın "mərkəzi" etməklə, avrosentrizm ideyasına yaşıl işlq yandırmırıqmı? Tarix və fəlsəfi elmlərə müraciət etdikdə, avroposentrizm ideyasının həmişə mübahisə və tənqid mövzusu olduğunu görmək olar.

XX əsrin bütün mədəniyyəti üçün xas olan xarakterik xüsusiyyətlərdən biri "avrosentrizm" ideallarının böhran keçirməsidir. Fəlsəfə elmində mövcud olan "avrosentrizm konsepsiyasına görə - elmdə, incəsənətdə, fəlsəfədə, ədəbiyyatda və s. mövcud olan həqiqi dəyərlərin inkişafı guya yalnız Avropada baş verir. Avropa xalqlarının həyat tərzinin üstünlüyünü izah etməyə söykənən bu tarixi-fəlsəfi konsepsiyaya görə, Avropa xalqları və Qərbi Avropa sivilizasiyası mədəni sferada digər xalqlardan və sivilizasiyalardan üstündür. Avrosentrizmə (və ya qərbsentrizmə) görə liberalizmin Qərb modeli dünya təkamülünün zirvəsindən başqa bir şey deyil; bütün müasir elm – Qərbi Avropanın "övladı", "varisidir". Bu "avrosentrizm konsepsiyası"nın qısa mahiyyətidir (Religiozna-ya tolerantnost: kultura sosushestvovaniya v Azerbaydjane, 2015).

Lakin "avrosentrizm"dən fərqli olaraq, "avropaçılıq" termini tamamilə başqa məna kəsb edir. Bu gün bir çox tədqiqatçılar, siyasətçilər və sosioloqlar "avrosentrizm"dən deyil, daha çox "avropaçılıq"dan – yəni Avropa ölkələrinin ümumbəşəri dəyərlər əsasında iqtisadi və siyasi birləşməsini, Avropa ölkələrinin tarixi, sosial, mədəni və mənəvi birliyini müdafiə edən ideoloji hərəkatdan, onun xalqları arasında mövcud olan oxşar xüsusiyyət və keyfiyyətlər toplusundan danışırlar. Qeyd etmək lazımdır ki, "avropaçılıq" ideyası "avrosentrizm"dən fərqli olaraq, Avropa mənəvi və mədəni dəyərlərinin yeganə "həqiqi", "əsl", "üstün" olduğunu iddia etmir. Reallıq ondan ibarətdir ki, "avropaçılıq" təbii ki, Avropadan kənarda mövcud olan, konkret mədəni və tarixi birliklərin "qloballaşmasında", onun dəyərlərinin bütün dünyaya ötürülməsində özünü göstərən formalardan yalnız biridir.

## Nəticə

Müasir dünyada həyatın bütün sahələrinin qloballaşması kontekstində Qərbi Avropa dəyərlərinin, dünyagörüşünün və mədəniyyətinin digər xalqların mədəniyyətlərinə və əks gediş inteqrasiyası qaçılmazdır. Lakin son nəticədə ölkəmizin bu günkü vəziyyəti, inkişaf meyilləri məhz bizim ənənələrimizə münasibətimizdən asılıdır.

Digər xalqın mədəniyyətinin mənimsənilməsi, bundan sonra onu mənimsəmiş, iqtibas etmiş xalqlar üçün onların mədəniyyətlərinin ayrılmaz bir hissəsinə çevrilir və onların sonrakı inkişafına yeni bir təkan verir.

"Egosentrizm"in – yəni eqoizmin, xudbinliyin ifrat dərəcəsinin aradan qaldırılması digər dəyərləri, dünyagörüşü münasibətlərini anlamaq üçün, öz mədəniyyətinin sərhədlərini müəyyənləşdirmək üçün bir addımdır. "Avrosentrizm"in böhranının şahidi olan XX əsrin sonu – XXI əsrin əvvəllərində, "qloballaşma" şəraitində mədəniyyətlərin qaçılmaz surətdə qarşılıqlı təsir əlaqəsi baş verir və beləliklə, mədəniyyətlərin dialoqu problemi nəzəri anlayış sahəsindən praktik həll sahəsinə keçir.

## Ədəbiyyat

1. *Azərbaycançılıq ideologiyası: ənənə və müasirlik*. (2019). Elm və təhsil.
2. *Azərbaycan multikulturalizminin ədəbi-bədii qaynaqları.* (2016). I kitab. Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi. Mütərcim.
3. *Azərbaycan multikulturalizminin elmi-fəlsəfi və ictimai-publisistik qaynaqları.* (2021). II kitab. Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi. RS Poliqraf MMC.
4. Həbibbəyli, Ə. İ. (2017). *Geosiyasi reallıqlar və multikultural dəyərlər*.
5. İsmayılov, N. I., Yusifova, S. F. (2016, 04 iyun). *Multikulturalizm Azərbaycanda reallıqdır*. Multikulturalizm Azərbaycanın dövlət siyasəti və cəmiyyətin həyat tərzidir. IV Beynəlxalq Elmi konfransın materialları. Azərbaycan Universiteti.
6. "Müxtəlifliyin qorunması: 2024-cü ildə İslamofobiya ilə mübarizə" mövzusunda beynəlxalq konfransın iştirakçılarına. İlham Əliyev. Azərbaycan Respublikasının Prezidenti. Bakı şəhəri, 7 mart 2024-cü il.
   https://president.az/az/articles/view/65229
7. Niftiyev, N. M. (2015). *Azərbaycanda birgəyaşayış və multikulturalizm*.
8. Niftiyev, N. M. (2017). *Mətbuatda multikulturalizm: Azərbaycan və dünya təcrübəsi*.
9. *Tolerantlıq və multikulturalizm: beynəlxalq sənədlər toplusu*. (2017). Şans Mətbəə LTD.
10. Abdullabekov, E. (2015, 11 dekabr). Multikulturalizm – vajniy aspekt tolerantnosti.
    http://www.echo.az/article.php?aid=93456
11. Ismayilov, N. I., & Yusifova, S. F. (2016, 13-14 oktyabr). *Multikulturalizm i Evropeyskie realii*. "Müstəqillik illərində Azərbaycanın sosial-iqtisadi, siyasi və mədəni inkişafı" Respublika Elmi konfransının materialları. Sumqayıt Dövlət Universiteti.
12. Ismayilov, N. I., & Yusifova, S. F. (2017). Traditsii multikulturalizma v Azerbaydjane. *Modern Science International scientific journal,* 6(2), 91-94.
13. Ismayilov, N. I., & Yusifova, S. F. (2017). Multiculturalism – theory and practice. *European Applied Sciences*, 3(August), 56-57.
14. Religioznaya tolerantnost: kultura sosushestvovaniya v Azerbaydjane. (2015, 9 sentyabr). *Vestnik Kavkaza*.
    https://vestikavkaza.ru/articles/Religioznaya-tolerantnost-kultura-sosushchestvovaniya-v-Azerbaydzhane.html

Daxil oldu: 25.09.2024
Baxışa göndərildi: 09.10.2024
Təsdiq edildi: 29.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/38-42

**Günay Əkbərova**
Zəngilan rayon 33 nömrəli tam orta məktəb
doktorant
gunay.akbarova.zabil@gmail.com

# İsmət İnönü: siyasi lider və modernləşmə dövrünün təmsilçisi

**Xülasə**

Məqalə Türkiyə Cümhuriyyətinin modernləşmə dövrünün əsas simalarından olan İsmət İnönünün şəxsiyyəti və fəaliyyətinin Şəvkət Sürəyya Aydəmirin yaradıcılığında təsviri məsələlərini araşdırır. Tədqiqatın əsas mənbəyi müəllifin üç cildlik "İkinci Adam" əsəridir. Araşdırmanın aktuallığı İnönü dövrünün Türkiyə tarixində modernləşmə prosesinin ən intensiv mərhələlərindən biri olması və Aydəmirin əsərlərinin bu dövrün ən mötəbər ilkin mənbələrindən sayılması ilə şərtlənir.

Araşdırmada İnönünün həm siyasi lider, həm də modernləşmə prosesinin təmsilçisi kimi fəaliyyəti təhlil edilir. Məqalə iki əsas hissədən ibarətdir: birinci hissədə Aydəmirin yaradıcılığında İnönü obrazının təşəkkülü prosesi, müəllifin İnönü ilə şəxsi münasibətləri və bunun yaradıcılığına təsiri araşdırılır; ikinci hissədə isə İnönünün modernləşdirici fəaliyyətinin təsviri məsələləri – iqtisadi modernləşmə siyasəti, sosial-mədəni transformasiya və siyasi sistemin demokratikləşdirilməsi prosesi təhlil edilir.

Tədqiqat nəticəsində müəyyən edilmişdir ki, Aydəmirin əsərlərində İnönü obrazı tarixi şəxsiyyət, modernləşmə prosesinin lideri və demokratik transformasiyanın təminatçısı kimi təqdim edilmişdir. İnönü dövrünün modernləşmə siyasəti iqtisadi, sosial-mədəni və siyasi sahələrdə paralel şəkildə həyata keçirilmiş, bu da transformasiya prosesinin kompleks xarakterini təmin etmişdir. Xüsusilə İkinci Dünya müharibəsi dövründə və müharibədən sonrakı mərhələdə Türkiyənin beynəlxalq sistemə inteqrasiyası yeni keyfiyyət mərhələsinə qədəm qoymuşdur. Aydəmirin əsərlərində bu proseslərin sistemli təhlili və dərin interpretasiyası müasir türk tarixşünaslıq və ədəbiyyatşünaslığı üçün fundamental əhəmiyyət kəsb edir.

***Açar sözlər:*** *İsmət İnönü, modernləşmə siyasəti, Şəvkət Sürəyya Aydəmir, demokratik transformasiya, Türkiyə Cümhuriyyəti tarixi*

**Gunay Akbarova**
Zangilan secondary school No. 33
Ph. D. student
gunay.akbarova.zabil@gmail.com

# Ismet Inonu: Political Leader and Representative of the Modernization Era

**Abstract**

The article examines the descriptive issues of the identity and activities of Ismet Inonu, one of the main figures of the modernization period of the Republic of Turkey, in the work of Shavket Surayya Aydemir. The main source of the research is the author's three-volume work "The Second Man". The relevance of the research is due to the fact that Inonu's period was one of the most intensive stages of the modernization process in the history of Turkey, and Aydemir's works are considered among the most reliable primary sources of this period.

In the study, Inonu's activity as both a political leader and a representative of the modernization process is analyzed. The article consists of two main parts: the first part examines the formation process of Inonu's image in Aydemir's work, the author's personal relationship with Inonu and its influence on his work; and in the second part, descriptive issues of Inonu's modernizing activity –

economic modernization policy, socio-cultural transformation, and the process of democratization of the political system are analyzed.

As a result of the research, it was determined that in Aydemir's works, the image of Inonu was presented as a historical figure, a leader of the modernization process and a guarantor of democratic transformation. The modernization policy of the Inonu era was carried out in parallel in the economic, socio-cultural and political spheres, which ensured the complex character of the transformation process. Especially during the Second World War and in the post-war period, Turkey's integration into the international system entered a new qualitative phase. Systematic analysis and deep interpretation of these processes in Aydemir's works are of fundamental importance for modern Turkish historiography and literary studies.

***Keywords:*** *Ismet Inonu, modernization policy, Shavket Surayya Aydemir, democratic transformation, history of the Republic of Turkey*

## Giriş

Türkiyə Cümhuriyyətinin siyasi tarixində modernləşmə proseslərinin ən mühüm mərhələlərindən birinin əsas siması olan İsmət İnönünün şəxsiyyəti və çoxşaxəli fəaliyyəti dövrün görkəmli ziyalısı, tarixçisi və yazıçısı Şövkət Sürəyya Aydəmirin yaradıcılığında xüsusi yer tutur. Müəllifin İnönü haqqında yazdığı əsərlərdə, xüsusilə üç cildlik "İkinci Adam" əsərində təqdim edilən material, sadəcə bioqrafik məlumatlarla məhdudlaşmayıb, dövrün ictimai-siyasi transformasiyasının dərin təhlilini əhatə edir və bu prosesdə İnönünün rolunu hərtərəfli şəkildə işıqlandırır.

Tədqiqatın aktuallığı bir neçə fundamental amillə şərtlənir: birincisi, İnönü dövrü Türkiyə tarixində modernləşmə prosesinin ən intensiv mərhələlərindən biri olmuşdur və bu dövrün öyrənilməsi müasir Türkiyənin formalaşma prosesini anlamaq baxımından əhəmiyyətlidir; ikincisi, Aydəmirin əsərləri bu dövrün ən mötəbər ilkin mənbələrindən sayılır və müəllifin İnönü ilə şəxsi tanışlığı materiala xüsusi etibarlılıq qazandırır; üçüncüsü, İnönünün modernləşdirici fəaliyyətinin kompleks təhlili müasir dövrdə də öz aktuallığını qoruyub saxlayır (Aydəmir, 2023).

## Tədqiqat

## I Bölmə: Ş. S. Aydəmirin yaradıcılığında İnönü obrazının təşəkkülü

### 1.1. Müəllifin İnönü ilə şəxsi münasibətləri və bunun yaradıcılığına təsiri

Şövkət Sürəyya Aydəmirin İsmət İnönü ilə şəxsi tanışlığı və peşəkar əlaqələri onun yaradıcılığında xüsusi əhəmiyyət kəsb edir və əsərlərində təsvir olunan İnönü obrazının formalaşmasında həlledici rol oynamışdır. Müəllifin İnönü ilə ilk tanışlığı 1920-ci illərin əvvəllərinə təsadüf edir və sonrakı illərdə bu münasibətlər daha da dərinləşərək, professional səviyyədə inkişaf etmişdir.

Aydəmirin İnönü ilə müxtəlif dövrlərdə apardığı müsahibələr və şəxsi müşahidələri onun əsərlərində, xüsusilə "İkinci Adam" trilogiyasında özünəməxsus şəkildə əks olunmuşdur. Müəllif öz xatirələrində qeyd edir ki, İnönü ilə şəxsi söhbətləri zamanı onun dövlət idarəçiliyi fəlsəfəsini, siyasi dünyagörüşünü və modernləşmə haqqında fikirlərini daha yaxından öyrənmək imkanı əldə etmişdir. Bu şəxsi təmaslar Aydəmirin əsərlərində İnönü obrazının daha obyektiv və çoxşaxəli təsvirinə imkan yaratmışdır (Aydəmir, 2023).

Xüsusilə vurğulanmalıdır ki, Aydəmirin İnönü ilə münasibətləri sadəcə rəsmi və ya peşəkar xarakter daşımamış, eyni zamanda intellektual dialoq səviyyəsində inkişaf etmişdir. Müəllif öz əsərlərində İnönünün şəxsi kitabxanasından, mütaliə vərdişlərindən və intellektual maraqlarından da bəhs edir ki, bu da onun obrazının daha dolğun və hərtərəfli təsvirinə xidmət edir.

### 1.2. Əsərlərdə İnönünün tarixi şəxsiyyət kimi təsviri prinsipləri

Aydəmirin əsərlərində İnönünün tarixi şəxsiyyət kimi təsviri zamanı müəllif dörd əsas prinsipə əsaslanmışdır ki, bunlar əsərlərin elmi-tarixi dəyərini artırmaqla yanaşı, onların bədii-sənədli xarakterini də gücləndirmişdir. Birinci prinsip olan tarixi obyektivlik prinsipinə əsasən, müəllif İnönünün fəaliyyətini təsvir edərkən konkret tarixi faktlara və sənədli materiallara istinad edir, hadisələri dövrün kontekstində təhlil edir və şəxsi münasibətini faktoloji materialdan ayırmağa çalışır.

İkinci prinsip olan çoxşaxəli yanaşma prinsipi İnönünün fəaliyyətinin müxtəlif aspektlərini - siyasi, iqtisadi, sosial və mədəni sahələrdəki fəaliyyətini kompleks şəkildə təhlil etməyə imkan

verir. Bu prinsip sayəsində İnönü obrazı bütün mürəkkəbliyi və ziddiyyətləri ilə canlandırılır, onun qərarlarının motivləri və nəticələri geniş kontekstdə təhlil edilir (Aydəmir, 2023).

Üçüncü prinsip olan kontekstual təhlil prinsipi İnönünün fəaliyyətini dövrün tarixi şərtləri, beynəlxalq vəziyyət və ölkədaxili proseslər kontekstində nəzərdən keçirməyə imkan verir. Bu prinsip xüsusilə İkinci Dünya müharibəsi dövründə İnönünün xarici siyasətinin təhlili zamanı əhəmiyyətli rol oynayır.

Dördüncü prinsip olan şəxsi müşahidələrlə tarixi faktların sintezi prinsipi müəllifə İnönünün şəxsiyyətinin daha dərin və hərtərəfli təsvirini verməyə imkan yaradır. Bu prinsip sayəsində rəsmi tarixi faktlarla şəxsi müşahidələr üzvi şəkildə birləşdirilir və nəticədə daha canlı və inandırıcı bir obraz yaradılır.

### 1.3. Bədii-sənədli nəsrdə İnönü obrazının təkamülü

Aydəmirin yaradıcılığında İnönü obrazının təkamülü xronoloji ardıcıllıqla dörd əsas mərhələdə izlənilir ki, bu da tarixi proseslərin dinamikasını daha aydın şəkildə əks etdirməyə imkan verir. Birinci mərhələ olan Milli Mücadilə dövrü təsvirlərində İnönü hərbi lider və diplomat kimi təqdim edilir. Bu dövrdə onun Qərb dövlətləri ilə aparılan danışıqlardakı rolu, xüsusilə Lozan konfransındakı fəaliyyəti ətraflı təhlil edilir.

Baş nazirlik dövrünün təhlilində İnönünün iqtisadi və sosial islahatçı kimi fəaliyyəti ön plana çəkilir. Müəllif xüsusilə 1930-cu illərdə həyata keçirilən dövlətçilik siyasətinin mahiyyətini və nəticələrini geniş təhlil edir. Bu dövrdə İnönünün sənayeləşmə proqramları, dəmir yolu şəbəkəsinin genişləndirilməsi və təhsil islahatları sahəsindəki fəaliyyəti ətraflı şəkildə işıqlandırılır.

Prezidentlik dövrünün təsvirində əsas diqqət İnönünün müharibə şəraitində ölkəni idarəetmə bacarığına və xarici siyasətdəki məharətinə yetirilir. Bu dövrdə onun neytral siyasəti, iqtisadi çətinliklərlə mübarizə taktikası və daxili sabitliyi qorumaq üçün həyata keçirdiyi tədbirlər geniş təhlil edilir.

Çoxpartiyalı sistemə keçid dövrünün interpretasiyasında Aydəmir xüsusi diqqəti İnönünün demokratikləşmə prosesindəki roluna yönəldir. Bu mərhələdə müəllif İnönünün öz hakimiyyətini məhdudlaşdırmaq və demokratik təsisatların formalaşmasına şərait yaratmaq istiqamətindəki fəaliyyətini təhlil edir ki, bu da onun dövlət xadimi kimi yetkinliyini göstərən əsas amillərdən biri kimi qiymətləndirilir.

## II Bölmə: İnönünün modernləşdirici fəaliyyətinin təsviri

### 2.1. İqtisadi modernləşmə siyasəti

Aydəmirin əsərlərində İnönünün iqtisadi modernləşmə siyasəti dörd əsas istiqamətdə təhlil edilir ki, bunların hər biri Türkiyənin müasirləşməsi prosesində fundamental əhəmiyyətə malik olmuşdur. Birinci istiqamət olan dövlətçilik siyasətinin tətbiqi prosesində İnönünün rolu xüsusi vurğulanır. Müəllif göstərir ki, 1930-cu illərdə həyata keçirilən dövlətçilik siyasəti sadəcə iqtisadi deyil, həm də sosial modernləşmənin təməlini təşkil etmişdir. Bu siyasətin nəticəsində dövlət sektorunun güclənməsi, milli sənayenin formalaşması və iqtisadi müstəqilliyin təmin edilməsi kimi fundamental məqsədlərə nail olunmuşdur (Heper, 1998).

Sənayələşmə proqramlarının həyata keçirilməsi ikinci əsas istiqamət kimi təhlil edilir. Aydəmir xüsusi diqqəti birinci və ikinci beşillik sənayələşmə planlarının reallaşdırılması prosesində İnönünün şəxsi təşəbbüslərinə və idarəetmə metodlarına yönəldir. Müəllif göstərir ki, bu dövrdə qurulan sənaye müəssisələri, xüsusilə tekstil, şüşə, kağız və kimya sənayesi sahəsindəki fabriklər, sonrakı illərdə Türkiyə iqtisadiyyatının lokomotivlərinə çevrilmişdir.

Üçüncü istiqamət kimi isə maliyyə islahatları ətraflı təqdim edilir və bu kontekstdə Mərkəzi Bankın yaradılması, milli valyutanın sabitliyinin təmin edilməsi və bank sisteminin modernləşdirilməsi kimi tədbirlər təhlil edilir. Aydəmir xüsusi vurğulayır ki, bu islahatlar Türkiyənin maliyyə sisteminin müasirləşməsində və beynəlxalq maliyyə sisteminə inteqrasiyasında həlledici rol oynamışdır.

### 2.2. Sosial-mədəni transformasiya

İnönü dövründə sosial-mədəni transformasiya prosesi kompleks və çoxşaxəli xarakter daşımışdır. Zürcherin qeyd etdiyi kimi, bu transformasiyanın əsas məqsədi cəmiyyətin bütün təbəqələrini əhatə edən fundamental dəyişikliklərin həyata keçirilməsi idi (Zürcher, 2004, p. 167).

Təhsil sistemində aparılan islahatlar xüsusilə Kənd İnstitutlarının yaradılması ilə yeni mərhələyə qədəm qoydu. Bu təhsil müəssisələri təkcə tədrislə məhdudlaşmır, eyni zamanda kənd yerlərində sosial və mədəni inkişafın katalizatoru rolunu oynayırdı

Qadın hüquqları məsələsi İnönü dövrünün ən əhəmiyyətli nailiyyətlərindən biri kimi qiymətləndirilməlidir. Bu dövrdə qadınların ictimai həyatda iştirakı yalnız kəmiyyət baxımından deyil, keyfiyyət baxımından da əhəmiyyətli dərəcədə artmışdır (Ahmad, 1993, s. 256). Qadınların ali təhsil müəssisələrində təmsilçiliyi, dövlət qulluğunda və məşğulluqda iştirakı sistemli şəkildə dəstəklənmişdir.

İncəsənət və mədəniyyət sahəsində aparılan islahatlar dövrün spesifik xüsusiyyətlərini əks etdirirdi. Bu dövr "mədəni sintez" dövrü kimi səciyyələndirilə bilər (Weiker, p. 178) Bir tərəfdən Qərb mədəniyyəti ilə inteqrasiya prosesi sürətlənir, digər tərəfdən milli mədəni dəyərlərin qorunmasına xüsusi diqqət yetirilirdi. Opera və balet teatrlarının açılması, klassik Türk musiqisinin inkişafı, ədəbiyyatda yeni cərəyanların formalaşması bu dövrün xarakterik xüsusiyyətləri idi (Koçak, 2008, s. 432).

**2.3. Siyasi sistem və idarəetmənin transformasiyası**

Siyasi sistemin transformasiyası prosesi İnönü dövrünün ən mürəkkəb və ziddiyyətli aspektlərindən biri idi. Bu transformasiya prosesi həm daxili, həm də xarici amillərin təsiri altında formalaşırdı (Koçak, 2008, s. 289). Çox partiyalı sistemə keçid sadəcə formal-hüquqi dəyişiklik deyil, cəmiyyətin siyasi şüurunun transformasiyası prosesi idi. Demokrat Partiyanın yaradılması və siyasi rəqabət mühitinin formalaşması prosesində İnönünün mövqeyi xüsusi əhəmiyyət kəsb edirdi (Lewis, 2002, p. 243).

İdarəetmə sisteminin modernləşdirilməsi istiqamətində aparılan islahatlar dövrün tələblərinə uyğun şəkildə həyata keçirilir və həmçinin bürokratik aparatın təkmilləşdirilməsi, dövlət qulluğu sisteminin yenidən qurulması və idarəetmədə səmərəliliyin artırılması bu dövrün prioritet məsələlərindən idi (Ortaylı, 2018, s. 345).

İdarəetmə sistemində aparılan islahatlar zamanı xüsusi diqqət mərkəzləşmə ilə yerli özünüidarəetmə arasında optimal balansın yaradılmasına yetirilirdi.

Xarici siyasət sahəsində həyata keçirilən transformasiya İkinci Dünya müharibəsinin yaratdığı yeni reallıqları nəzərə alırdı. Bu dövrdə Türkiyənin beynəlxalq sistemə inteqrasiyası yeni mərhələyə qədəm qoymuşdu (Aydəmir, 2023, s. 456). Türkiyənin NATO-ya doğru istiqamətlənməsi, regional əməkdaşlıq sistemlərində iştirakı və Qərb dünyası ilə münasibətlərin intensivləşməsi bu dövrün xarakterik xüsusiyyətləri idi.

## Nəticə

Aparılan tədqiqat nəticəsində Şəvkət Sürəyya Aydəmirin yaradıcılığında İsmət İnönü obrazının təşəkkülü və təkamülü prosesinin özünəməxsus xüsusiyyətləri aşkar edilmiş, bu kontekstdə bir sıra fundamental elmi nəticələr əldə edilmişdir. İlk növbədə, müəyyən edilmişdir ki, Aydəmirin yaradıcılığında İnönü obrazı üç əsas prizmadan – tarixi şəxsiyyət, modernləşmə prosesinin lideri və demokratik transformasiyanın təminatçısı kimi təqdim edilmişdir.

Tədqiqatın ikinci mühüm nəticəsi Aydəmirin interpretasiya metodologiyası ilə bağlıdır. Müəyyən edilmişdir ki, yazıçının İnönü ilə şəxsi münasibətləri və peşəkar əlaqələri onun yaradıcılığında xüsusi metodoloji yanaşmanın formalaşmasına səbəb olmuşdur. Heperin də qeyd etdiyi kimi, bu metodologiya tarixi faktlarla şəxsi müşahidələrin, analitik təhlillə bədii təsvirin üzvi sintezinə əsaslanır (İnönü, 2016, s. 219). Bu sintez sayəsində Aydəmir İnönünün şəxsiyyətinin və fəaliyyətinin elə aspektlərini açıqlaya bilmişdir ki, bunlar digər tarixi mənbələrdə öz əksini tapmamışdır.

İnönünün modernləşdirici fəaliyyətinin təhlili kontekstində əldə edilən üçüncü mühüm nəticə onun islahatlar strategiyasının sistemli xarakteri ilə bağlıdır. Zürcherin tədqiqatlarında göstərildiyi kimi, İnönü dövrünün modernləşmə siyasəti üç fundamental istiqamətdə – iqtisadi, sosial-mədəni və siyasi sahələrdə paralel şəkildə həyata keçirilmişdir ki, bu da transformasiya prosesinin kompleks xarakterini təmin etmişdir (Zürcher, 2004, p. 437). Aydəmirin əsərlərində bu proseslərin təsviri xüsusi elmi-tarixi əhəmiyyət kəsb edir, çünki müəllif hadisələrin bilavasitə şahidi olmuş və proseslərin daxili dinamikasını dərindən dərk etmişdir.

Dördüncü əhəmiyyətli nəticə İnönü dövrünün demokratikləşmə prosesi ilə bağlıdır. Bu proses təkcə siyasi sistemin transformasiyası ilə məhdudlaşmamış, eyni zamanda cəmiyyətin fundamental dəyərlər sisteminin dəyişməsinə də təsir göstərmişdir (Ahmad, 1993, p. 637). Aydəmirin əsərlərində bu proseslərin təsviri zamanı xüsusi diqqət çoxpartiyalı sistemə keçidin psixoloji və sosial-mədəni aspektlərinə yetirilmişdir ki, bu da həmin dövrün daha dərindən anlaşılmasına imkan verir.

Beşinci mühüm nəticə İnönünün xarici siyasət strategiyasının təhlili ilə əlaqədardır. İkinci Dünya müharibəsi dövründə və müharibədən sonrakı mərhələdə Türkiyənin beynəlxalq sistemə inteqrasiyası yeni keyfiyyət mərhələsinə qədəm qoymuşdur (Ortaylı, 2018, s. 650). Aydəmirin əsərlərində bu prosesin təsviri zamanı xüsusi diqqət İnönünün balanslaşdırılmış xarici siyasət strategiyasına və onun uzunmüddətli nəticələrinə yetirilmişdir.

Nəhayət, tədqiqatın altıncı mühüm nəticəsi İnönü dövrünün müasir Türkiyənin formalaşmasındakı rolu ilə bağlıdır. Bu dövrdə həyata keçirilən islahatlar – iqtisadi modernləşmə, sosial-mədəni transformasiya və siyasi sistemin demokratikləşdirilməsi – müasir Türkiyə dövlətinin və cəmiyyətinin təşəkkülündə həlledici rol oynamışdır (Weiker, 357). Aydəmirin əsərlərində bu proseslərin sistemli təhlili və dərin interpretasiyası müasir türk tarixşünaslığı üçün fundamental əhəmiyyət kəsb edir.

Beləliklə, aparılan tədqiqat göstərir ki, Şəvkət Sürəyya Aydəmirin yaradıcılığında İnönü obrazı və onun modernləşdirici fəaliyyətinin təsviri, Türkiyə tarixinin bu mürəkkəb dövrünün öyrənilməsi üçün əvəzsiz elmi-tarixi mənbə rolunu oynayır.

## Ədəbiyyat

1. Aydəmir, Ş. S. (2023). *İkinci Adam.* Cild 1. Remzi Kitabevi.
2. Aydəmir, Ş. S. (2023). *İkinci Adam.* Cild 2. Remzi Kitabevi.
3. Aydəmir, Ş. S. (2023). *İkinci Adam.* Cild 3. Remzi Kitabevi.
4. Aydəmir, Ş. S. (2023). *Tek Adam: Mustafa Kemal.* Cild 3. Remzi Kitabevi.
5. İnönü, İ. (2016). *Defterler* (1919-1973). Yapı Kredi Yayınları.
6. Koçak, C. (2008). *Türkiye'de Milli Şef Dönemi (1938-1945).* İletişim Yayınları.
7. Ortaylı, İ. (2018). *"Türkiye'nin Yakın Tarihi".* Timaş Yayınları.
8. Ahmad, F. (1993). *The Making of Modern Turkey.* Routledge.
9. Heper, M. (1998). *Ismet Inonu: The Making of a Turkish Statesman*. Brill.
10. Lewis, B. (2002). *The Emergence of Modern Turkey.* Oxford University Press.
11. Weiker, W. F. *Political Tutelage and Democracy in Turkey.* Brill.
12. Zürcher, E. J. (2004). *Turkey: A Modern History.* I. B. Tauris.

Daxil oldu: 15.09.2024
Baxışa göndərildi: 30.09.2024
Təsdiq edildi: 23.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/43-49

**Şövkət Rəhimova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
shovkatrehimova98@gmail.com

# İsmayıl Hidayətzadənin teatr sənətində irsi: "Yeddi gözəl" və "Koroğlu" tamaşaları

**Xülasə**

Bu məqalədə Azərbaycan teatrının aktyoru və rejissoru, eyni zamanda SSR-nin xalq artisti İsmayıl Hidayətzadənin ən məşhur tamaşalarından olan "Yeddi gözəl" baleti və "Koroğlu" operasının məzmunu, rejissor yanaşması, aktyor ifası, folklor elementlərinin istifadəsi, tematik islahatlar və ümumi əhəmiyyəti barədə ətraflı təhlil aparılmışdır. Bununla yanaşı, "Yeddi gözəl" və "Koroğlu" tamaşaları" adlı məqalə, İsmayıl Hidayətzadənin Azərbaycan teatr sənətinə töhfələrini və irsini təhlil edir. Məqalədə, İsmayıl Hidayətzadənin Azərbaycan teatrına gətirdiyi yeniliklər, əsərlərindəki rejissor yanaşması, simvolların istifadəsi və tamaşalarda qurduğu poetik səhnə dünyası ətraflı incələnir. Xüsusilə Hidayətzadənin Nizaminin "Yeddi gözəl" əsərinə və xalq dastanına əsaslanan "Koroğlu" tamaşasına gətirdiyi fərqli bədii və estetik yanaşma analiz edilir.

Məqalədə, "Yeddi gözəl" tamaşasında gözəllik və sevgi mövzularının necə təcəssüm olunduğu, simvolik və metaforik elementlərin necə işlədildiyi və tamaşanın bədii strukturunun tamaşaçıda yaratdığı təsirlər təhlil olunur. Bununla yanaşı, "Koroğlu" tamaşasında qəhrəmanlıq, azadlıq mübarizəsi və xalqın iradəsi kimi mövzuların necə səhnələşdirildiyi və rejissorun əsərə fərqli bir baxış bucağı gətirdiyi də araşdırılır.

Ümumiyyətlə, bu məqalə, İsmayıl Hidayətzadənin əsərlərində teatrın incəsənət dili və milli dəyərlərin necə sintez edildiyini, onun rejissor kimi unikal stilini və Azərbaycan teatrına etdiyi təsirləri təhlil etməyə çalışır.

***Açar sözlər:*** *İsmayıl Hidayətzadə, Koroğlu, Yeddi gözəl, rejissor, aktyor, Azərbaycan teatrı, səhnə, tamaşa, folklor*

**Shovkat Rahimova**
Azerbaijan State University of Culture and Arts
Master student
shovkatrehimova98@gmail.com

# Ismayil Hidayatzade's Legacy in Theater Art: The Performances of "The Seven Beauties" and "Koroghlu"

**Abstract**

In this article, the content, director's approach, actor's performance, the use of folklore elements, thematic reforms and general significance of the ballet "The Seven Beauties" and the opera "Koroghlu", which are among the most famous performances of Ismayil Hidayatzade, the actor and director of the Azerbaijani theater, are detailed in this article. In addition, the article "The Seven Beauties' and 'Koroghlu' plays" analyzes Ismayil Hidayatzade's contributions and legacy to Azerbaijani theater art. In the article, the innovations brought by Ismayil Hidayatzade to the Azerbaijani theater, the director's approach in his works, the use of symbols and the poetic stage world he built in the plays are analyzed in detail. In particular, the different artistic and aesthetic approach brought by Hidayatzade to Nizami's "The Seven Beauties" and the play "Koroghlu" based on the folk epic is analyzed.

The article analyzes how the themes of beauty and love are embodied in the play "The Seven Beauties", how symbolic and metaphorical elements are used, and the effects of the play's artistic

 

structure on the audience. Along with this, it is also investigated how themes such as heroism, freedom struggle and the will of the people are staged in the play "Koroghlu" and how the director brings a different point of view to the work.

In general, this article tries to analyze how the artistic language of theater and national values are synthesized in the works of Ismayil Hidayatzade, his unique style as a director and his influence on Azerbaijani theater.

***Keywords:*** *Ismayil Hidayatzade, Koroghlu, The Seven Beauties, director, actor, Azerbaijani theater, stage, performance, folklore*

## Giriş

Məqalədə İsmayıl Hidayətzadənin “Yeddi gözəl” və “Koroğlu” tamaşaları üzərində aparılan təhlillə onun teatr sənətindəki irsi araşdırılır. “Yeddi gözəl” tamaşası folklor motivləri və müasir teatr estetikası arasında bir körpü rolunu oynayır, cəmiyyətin gözəllik anlayışını və sosial dəyərləri tədqiq edir. Hidayətzadənin “Koroğlu” operası isə Azərbaycan milli mədəniyyətinin parlaq nümunəsi olaraq, xalq qəhrəmanlığını və tarixi mübarizəni əks etdirir (Cəfərov, 2005).

İsmayıl Hidayətzadənin 1952-ci ildə təqdim etdiyi “Yeddi gözəl” tamaşası, Azərbaycan teatrında əhəmiyyətli bir yer tutaraq, yeddi gözəl qızın bir oğlanla olan sevgi hekayəsi vasitəsilə cəmiyyətin gözəllik anlayışını və sosial dəyərləri tədqiq edir. Folklor motivləri, dövrün estetikasına sintez edilərək istifadə olunur. Hidayətzadə, tamaşada daxili gözəlliyin önəmini vurğulayaraq, qadın müstəqilliyi və sosial normlara qarşı mübarizəni işıqlandırır. Aktyorların inandırıcı ifası, tamaşanın emosional dərinliyini artırır və izləyiciləri düşünməyə dəvət edir (Degen, Stupnikov, 2012).

**Tədqiqat**

İsmayıl Hidayətzadə, Azərbaycan teatrında tanınmış bir rejissor və aktyor kimi folklor motivlərinin və milli dəyərlərin müasir teatr dilində təqdimatında özünəməxsus bir üslub inkişaf etdirmişdir. Onun “Yeddi gözəl” tamaşası, yalnız bir səhnə əsəri olmaqla qalmayıb, eyni zamanda milli kimliyin, sevginin, dostluğun və cəmiyyətin dəyərlərinin dərin müzakirəsinə açıq bir platforma təqdim edir (Həsənova, 2023).

Bu tamaşa Azərbaycan teatrında folklor motivlərinin müasir teatr estetikası ilə birləşdirilməsinin gözəl bir nümunəsidir. Onun ərsəyə gəlməsində bir neçə əsas şəxsin rolu olmuşdur:

İsmayıl Hidayətzadə tamaşanın rejissoru və liberetto müəlliflırindən biridir. O, folklor elementlərini müasir teatr dilinə uyğunlaşdıraraq yeni bir estetik dil formalaşdırmışdır. Hidayətzadə hekayənin vizual və emosional təsirini artırmaq üçün səhnə tərtibatı, işıqlandırma və musiqidəki seçimlərinə xüsusi diqqət yetirmişdir. Onu da qeyd edək ki, bu baletin yaradılması fikrini istedadlı rejissor İsmayıl Hidayətzadə Q. Qarayevə tövsiyə etmişdi (Həsənova, 2023).

Qara Qarayev tamaşanın musiqisinin bəstəkarıdır. Onun yaratdığı musiqi, xalq melodiyalarının dövrün üslubları ilə birləşməsini təmin edərək, tamaşanın emosional dinamikasını artırmışdır. Tamaşanın xoreoqrafı Pyotr Qusevdir. O, folklor rəqsləri ilə müasir rəqs elementlərini birləşdirərək, tamaşanın estetik cəhətini gücləndirmişdir. Aktyor heyəti tamaşada baş rolu oynayan aktyorlar, öz xarakterlərini inandırıcı şəkildə təqdim edərək hekayənin dərinliyini artırmışdır. Onlar Hidayətzadənin bədii dilini daha da canlı edir, izləyicilərin emosional təcrübəsini zənginləşdirir (Kaldış, 1973).

Bu şəxslərin birgə fəaliyyəti, “Yeddi gözəl” tamaşasının yalnız bir səhnə əsəri olmamaqla yanaşı, milli kimliyin və mədəni irsin müzakirəsinə açıq bir platforma olmasına imkan tanımışdır.

“Yeddi gözəl” əsəri Azərbaycan folklorunun zənginliyini əks etdirən, eyni zamanda cəmiyyətin dəyərlərinə işıq tutan bir hekayədir. Tamaşada yeddi gözəl qızın bir oğlanın sevgi hekayəsi vasitəsilə cəmiyyətin gözəllik anlayışı, sevgi və dostluq dəyərləri tədqiq olunur.

Tamaşa hər bir gözəlin özünəməxsus xüsusiyyətləri, xarakterləri və hekayələri ilə fərqlənir. Bu qızlar, müxtəlif sosial və mədəni mühitlərin təmsilçiləridir. Onların arasında olan münasibətlər, sevginin, dostluğun, gözəlliyin və sosial normaların müzakirəsinə zəmin yaradır. Hər bir gözəl, cəmiyyətin gözəllik standartlarını və bu standartlara qarşı olan mübarizəni əks etdirir. Eyni zamanda bu hekayə vasitəsilə İsmayıl Hidayətzadə gözəlliyin yalnız zahiri cəhətdən deyil, daxili gözəlliyin də əhəmiyyətini vurğulayır (Xudavərdiyeva, 2017).

İsmayıl Hidayətzadənin "Yeddi gözəl" tamaşasındakı rejissor yanaşması, onun bədii dilini və estetik qaydalarını müəyyən edir. Rejissor tamaşanın səhnə tərtibatında, işıqlandırmada və musiqidəki seçimləri ilə izləyicini hekayənin içində daha dərin bir təcrübəyə cəlb edir. Hidayətzadə səhnə təsvirlərini çox canlı və dinamik şəkildə təqdim edir, bu da tamaşanın vizual cəhətini gücləndirir (Qədirova, 2017).

Hidayətzadə dövrün teatr estetikası ilə folklor elementlərini birləşdirərək tamaşada həm ənənəvi, həm də müasir cəhətləri birləşdirir. Tamaşanın musiqisi, xalq melodiyaları ilə müasir musiqi üslublarının sintezini əks etdirir. Bu yanaşma tamaşanın ritmini artırır və izləyicinin hisslərinə təsir edir.

Rejissor, hər bir obrazın dramatik inkişafını diqqətlə izləyir. Bu, tamaşanın dinamikasını artırır və izləyicini daha çox hekayənin içində hiss etdirir. Hidayətzadənin istifadə etdiyi simvolizm, tamaşanın dərinliyini artıraraq, izləyicinin düşünməyə və müzakirəyə cəlb etməsinə imkan tanıyır (Kaldış, 1973).

"Yeddi gözəl" tamaşasında aktyorların ifası əsərin ruhunu formalaşdıran əsas amillərdəndir. Hidayətzadə aktyorları yalnız səhnə simvolları kimi deyil, eyni zamanda xarakterlərinin emosional dünyasını canlı şəkildə təqdim edən ifaçılar olaraq tanıdır. Aktyorlar, hər bir obrazın xarakterini, düşüncələrini və hisslərini səmimi şəkildə əks etdirir.

Tamaşada baş rolları oynayan aktyorlar, öz xarakterlərini izləyiciyə inandırıcı şəkildə təqdim edir. Hər bir gözəl, öz fərqli emosiyalarını, gözəllik anlayışını və şəxsi mübarizələrini ortaya qoyur. Bu, tamaşanın dərinliyini artıraraq, izləyicinin empatini oyadır. Aktyorların ifası Hidayətzadənin bədii dilini daha da canlı edir, tamaşanın dramatik təsirini gücləndirir (Qriqoroviç, 1981).

Aktyorların ifasında, folklor elementlərinin istifadəsi də önəmlidir. Onlar, dövrün teatrdakı yenilikçi yanaşmaları, eyni zamanda ənənəvi oyun metodlarını birləşdirərək, izləyicinin marağını artırır. Hidayətzadə, gənc aktyorları öyrətməkdəki rolu ilə də tanınır; bu, onun teatr dünyasına olan bağlılığını və gənc istedadların inkişafına verdiyi dəstəyi göstərir (Qədirova, 2017).

"Yeddi gözəl" tamaşasında folklor elementlərinin istifadəsi, əsərin bədii dəyərini artırır. Hidayətzadə, Azərbaycan folklorunun zəngin motivlərini tamaşaya daxil edərək, xalqın mədəniyyətini ön plana çıxarır. Folklorun bu cür istifadəsi, gənc nəsillərə milli irsi tanıtmaq və yaşatmaq məqsədini güdür (Rəhimli, 2008).

Tamaşada, xalq musiqisi və rəqsləri, folklor ənənələrinin mükəmməl bir şəkildə nümayiş olunmasını təmin edir. Hidayətzadənin tətbiq etdiyi musiqi və rəqs elementləri, izləyicinin emosional təcrübəsini artırır və mədəni irsi daha da dərin bir şəkildə tanıdır.

Folklor motivlərinin tamaşada yer alması, milli kimliyin qorunması baxımından da əhəmiyyətlidir. Hidayətzadə, bu elementlər vasitəsilə, milli mədəniyyətin və dəyərlərin yaşadılmasına töhfə vermişdir. Bu, teatrın sosial və mədəni rolunu gücləndərir (Sadıxov, 2019).

"Yeddi gözəl" tamaşasında gözəllik, sevgi, dostluq və ailə dəyərləri ön planda durur. Hidayətzadə bu temaları müasir kontekstdə təqdim edərək, onların aktuallığını artırır. Tamaşada gözəlliyin yalnız zahiri görkəm deyil, həm də daxili gözəlliyin önəmi vurğulanır.

Hidayətzadənin təqdim etdiyi sevgi hekayəsi, cəmiyyətdəki qadın və kişi münasibətlərini müzakirə etməyə yönəldir. Tamaşada qadınların gücü, müstəqilliyi və özlərinə olan inamı ön plana çıxır. Eyni zamanda bu, sosial normlara qarşı olan mübarizəni də əks etdirir. Hidayətzadə, tamaşada qadınların güclü rolunu vurğulayaraq, cəmiyyətin gender bərabərliyi məsələsinə də diqqət çəkir.

Tamaşadakı dostluq münasibətləri, insanların bir-birinə olan dəstəyi və qarşılıqlı anlayışı ön plana çıxarır. Bu, izləyicilərə dostluğun əhəmiyyətini, bir-birinə olan bağlılığı xatırladır.

İsmayıl Hidayətzadənin "Yeddi gözəl" tamaşası, yalnız bir səhnə əsəri deyil, eyni zamanda milli kimliyin, mədəni irsin və sosial dəyərlərin dərin müzakirəsinə açıq bir platformadır. Rejissorun ustalıqla birləşdirdiyi bədii elementlər, aktyorların inandırıcı ifası və folklor motivlərinin düzgün istifadəsi, tamaşanın bədii dəyərini artırır.

Hidayətzadə, "Yeddi gözəl" ilə Azərbaycan teatrına yeni bir nəfəs gətirmiş, milli mədəniyyətin qorunmasına və yaşadılmasına böyük töhfə vermişdir. Bu tamaşa, yalnız əyləncə deyil, eyni zamanda düşüncəyə dəvət edən bir müzakirə mərkəzidir. Hidayətzadənin yaradıcılığı, gənc nəsillərə

öz irsini tanıtmış və yaşatmış, beləliklə də, Azərbaycan teatrının inkişafına əhəmiyyətli bir töhfə vermişdir (Rəhimli, 2008).

Digər haqqında danışacağımız tamaşa isə "Koroğolu" operasıdır. Bizlərdən hər birimiz dünyanı hiss etməyə və özümüzü dərk etməyə başlayandan bəri, xalq qəhrəmanımız Koroğlu haqqında nəğmələri, hikmətli sözləri, rəvayətləri və dastanları eşidib böyümüşük. Bu gün də Koroğlu irsi öz dəyərini itirmədən xalqımızın mədəni yaddaşında yaşayır. Xalq mədəniyyəti ilə dərin bağlılığı olan böyük bəstəkar Üzeyir bəy Hacıbəyli də öz ölməz "Koroğlu" operasında məhz bu irsi möhtəşəm şəkildə canlandırmışdır. O, xalq həyatını, əməkçi insanların öz azadlığı uğrunda apardığı qəhrəmanlıq mübarizəsini operasında parlaq şəkildə təsvir etmişdir.

Bu monumental inqilabi xalq epopeyası aşıq motivləri əsasında yazılmış və azərbaycan xalqının tarixi mübarizələrinə həsr olunmuşdur. Xalqın keçmişinə bu qədər dərindən nüfuz etmək və onun duyğularını musiqidə bu qədər güclü əks etdirmək Üzeyir bəyin böyük yaradıcılıq axtarışlarının və xalq mədəniyyətinə olan sevgisinin nəticəsidir. "Koroğlu" operası Üzeyir bəyin musiqi yaradıcılığının zirvəsi olmaqla yanaşı, həm də Azərbaycan musiqi mədəniyyətinin ən parlaq nümunələrindən biridir.

Azərbaycan mədəniyyəti və incəsənəti zəngin tarixi ilə dünya mədəni irsinə mühüm töhfələr verib. Bu tarixi nailiyyətlər sırasında Azərbaycan milli operasının inkişafında xüsusi yer tutan Üzeyir Hacıbəyovun "Koroğlu" operası möhtəşəm bir mərhələdir. 1937-ci il aprelin 30-da Bakıda səhnəyə qoyulan bu əsər təkcə musiqi tarixinə deyil, həm də Azərbaycan teatrının qızıl səhifələrinə yazılıb. İsmayıl Hidayətzadə tərəfindən səhnələşdirilən "Koroğlu" operası milli operanın inkişafında yeni istiqamətlər müəyyənləşdirdi və bu möhtəşəm əsər Azərbaycan teatrında ilk dəfə rejissor tərəfindən bu cür geniş miqyasda səhnəyə gətirildi. Bu, milli operanın teatr sənətimizə möhkəm bir bağla inteqrasiyasının göstəricisi idi.

İsmayıl Hidayətzadə Azərbaycan Opera və Balet teatrına baş rejissor olaraq keçid etdiyi dövrdə "Koroğlu" operası onun rəhbərliyi altında həyata keçirilən ilk tamaşa oldu. Bu, onun Oprea və Balet teatrında rejissor kimi debüt əsəri idi və o, azərbaycan teatrının səhnəsində milli musiqi və dram ənənələrini dərindən təcəssüm etdirən bu əsərlə teatr sənətimizin parlaq nailiyyətlərindən birinə imza atdı.

"Koroğlu" operasının əhəmiyyəti təkcə onun milli musiqi irsimizdəki dəyəri ilə məhdudlaşmır. Bu opera həm də 1938-ci ilin aprelində Moskvada keçirilən Azərbaycan incəsənəti ongünlüyündə təqdim edilərək, böyük bir mədəni hadisəyə çevrildi. Həmin dövrün ən önəmli mədəni hadisələrindən olan ongünlük çərçivəsində Azərbaycan incəsənəti sovet mədəniyyətinin ən parlaq nailiyyətlərindən biri kimi çıxış edirdi. SSRİ-nin müxtəlif respublikalarından olan sənətkarlar Moskvada öz mədəniyyətlərini nümayiş etdirərək, sovet xalqları arasında mədəni əlaqələri möhkəmləndirirdilər.

Azərbaycan incəsənəti ongünlüyündə nümayiş etdirilən əsərlər arasında Üzeyir Hacıbəyovun "Koroğlu" operası ən çox diqqət çəkən tamaşalardan biri oldu. Bu əsər Moskvada böyük müvəffəqiyyət qazandı və üç dəfə nümayiş etdirildi. Xüsusilə Stalinin və digər sovet rəhbərlərinin tamaşada iştirak etməsi, bu operanın SSRİ mədəniyyətinin tərkib hissəsi kimi böyük əhəmiyyətə malik olduğunu göstərirdi. Moskva tamaşaçıları "Koroğlu" operasının qəhrəmanlıq ruhunu, xalqın azadlıq mübarizəsini tərənnüm edən motivləri və musiqi əsasında qurulan epik səhnələri yüksək qiymətləndirdilər.

SSRİ qəzetlərində "Koroğlu" operasının müvəffəqiyyəti barədə çoxlu məqalələr yazıldı. "Pravda" qəzeti bu operanın möhtəşəm uğuru haqqında geniş bir məqalə dərc etdi və tamaşanın bədii keyfiyyətlərini yüksək qiymətləndirdi. "Trud" qəzeti isə Azərbaycan xalqının zəngin mədəni irsinin Moskvada böyük əzəmətlə təqdim edilməsini vurğulayırdı. Üzeyir Hacıbəyovun bu operası xalqın mədəni sərvətlərinin təntənəsini nümayiş etdirmək üçün əvəzolunmaz bir vasitə oldu.

"Koroğlu" operası uzun illərin axtarışlarının və zəhmətinin bəhrəsi idi. Üzeyir Hacıbəyov xalq dastanlarına, muğam sənətinə və Azərbaycan kəndlilərinin milli azadlıq mübarizəsinə həsr olunmuş epik bir əsər yaratmaq istəyirdi. Bu monumental inqilabi epopeya XVI-XVII əsrlərdə Azərbaycan kəndlilərinin apardığı mübarizəni əks etdirən dastanlar əsasında yazılmışdır. Üzeyir bəy bu əsəri

yaratmaq üçün xalq musiqisini dərindən öyrənmiş və rus, Qərb musiqi ənənələrini ustalıqla birləşdirmişdir.

"Koroğlu" operasının ilk tamaşası 1937-ci ildə M. F. Axundov adına Opera və Balet Teatrında keçirilmişdir. Həmin tamaşanın quruluşçu rejissoru İsmayıl Hidayətzadə, dirijoru isə Üzeyir Hacıbəyovun özü idi. Quruluşçu rəssam Rüstəm Mustafayev olmuşdur. Tamaşada Koroğlu rolunu Azərbaycanın dahi müğənnisi Bülbül ifa edirdi. O, Koroğlu obrazını böyük ustalıqla canlandıraraq, bu obrazı milli qəhrəmanlıq simvoluna çevirdi. Tamaşada Nigar rolunu G. İskəndərova, Həsən xan rolunu isə M. Bağırov ifa etmişdir. İsmayıl Hidayətzadə "Koroğlu" operasının rejissoru olaraq bir sıra mühüm tapşırıqları icra etmiş və tamaşanın bədii təsirini artırmaq üçün öz yaradıcılıq bacarıqlarını sərgiləmişdir.

"Koroğlu" Ü. Hacıbəyovun Azərbaycanın xalq ədəbiyyatına və folkloruna əsaslanaraq yaratdığı monumental bir operadır. Rejissorluq təhlili, operanın dramaturgiyasını, personajlarının inkişafını, səhnə tərtibatını və musiqi inteqrasiyasını əhatə edir.

"Koroğlu" operası, 16-cı əsrdə Azərbaycanda baş verən tarixi hadisələrə dayanır. Süjet, Həsən xanın qəddar əmrləri nəticəsində kəndlilərin mübarizəsi ətrafında cərəyan edir. Rejissor operanın beş pərdəlik strukturunu ustalıqla istifadə edərək, hekayənin gedişatını dinamik və cəlbedici edir:

Birinci pərdə: Bu pərdə, Həsən xanın qəddarlığını və kəndlilərin acınacaqlı vəziyyətini təqdim edir. Qoca çoban Əlinin gözlərinin çıxarılması, tamaşaçını xanın zülmü ilə tanış edir. Rövşənin Koroğlu adı alması, onun qəhrəmanlıq yoluna ilk addımını atmasıdır. Bu pərdədəki hissiyat, muzikal melodiyalarla doludur, burada Koroğlunun aşıq rolundakı ifası ön plandadır.

İkinci pərdə: Həsən xan, qonşu Ehsanpaşa ilə müttəfiqlik qurmağa çalışır. Kəndlilərin üsyanı daha da güclənir, bu da mübarizənin gedişatını göstərir. Rejissor bu pərdəni ikiqat gərginliklə təqdim edir: bir tərəfdən xanın zarafatı, digər tərəfdən kəndlilərin qəzəbi. Həmzə bəyin Koroğlunu aldatmaq planları, dramın gedişatını daha da intensifləşdirir.

Üçüncü pərdə: Üsyançı kəndlilərin qələbə qazanması üçün gözlədikləri döyüşün hazırlıqları burada yer alır. Koroğlunun dostları ilə birləşməsi, onun liderlik bacarığını nümayiş etdirir. Bu pərdə, xor səhnələri ilə zənginləşdirilmişdir, burada Koroğlunun şanlı döyüş nəğmələri ön plana çıxır.

Dördüncü pərdə: Həsən xanın və onun ətrafının arxa planda necə işlədiyi göstərilir. Xan sarayında baş verənlər, mübarizənin arxa fonunu təşkil edir. Koroğlunun ələ keçirməsi və Həsən xanın hiylələri, dramın pik nöqtəsinə çatdırılır.

Hidayətzadə, tamaşanın səhnə quruluşunu, aktyorların yerləşməsini və hərəkətlərini diqqətlə planlaşdırmışdır. O, səhnə arxitekturasından istifadə edərək, məkanın dinamikliyini artırmış, hər bir səhnənin emosional yükünü ortaya qoymuşdur.

Rejissor personajların xarakterlərini dərindən araşdıraraq, onların motivasiyalarını, hisslərini və mübarizələrini daha aydın şəkildə təqdim etmişdir. Koroğlu obrazının güclü lider kimi formalaşmasında, onun xarakterinin müxtəlif aspektlərini vurğulayan məqamlara xüsusi diqqət yetirmişdir.

Hidayətzadə, operada hərəkətlərin və rəqslərin mükəmməl bir şəkildə inteqrasiya olunmasını təmin edərək, musiqinin ritmini və melodiyasını səhnədə daha canlı şəkildə canlandırmışdır. O, milli rəqs və folklor elementlərini operanın vizual tərəfinə daxil edərək, tamaşanın milli ruhunu artırmışdır.

Hidayətzadə, tamaşanın emosional təsirini gücləndirmək üçün tamaşaçı ilə əlaqə yaratmağa çalışmışdır. O, aktyorların çıxışlarında, mimikalarında və bədən dilində tamaşaçının hisslərinə təsir edəcək nüanslar əlavə etmişdir.

Rejissor, Üzeyir Hacıbəyovun musiqisini operanın dramatik struktrasına uyğun şəkildə istifadə edərək, melodiyaların və sözlərin harmoniyasını təmin etmişdir. Musiqi, hekayənin təhlilində və qəhrəmanlıq hisslərinin vurğulanmasında mühüm rol oynamışdır.

Operanın librettosu H. İsmayılov və M. S. Ordubadi tərəfindən hazırlanmışdır və əsərin məzmunu xalq dastanları əsasında tərtib edilmişdir. Xalq musiqisinin aşıq üslubunda yazılmış bu opera Azərbaycan milli operasının inkişafında böyük rol oynadı. Üzeyir Hacıbəyov bu operada simfonik

orkestrin tərkibinə milli musiqi alətlərini də əlavə edərək, əsərin milli səciyyəsini daha da gücləndirmişdir (Rəhimli, 2005).

"Koroğlu" operası musiqisi və möhtəşəm səhnələri ilə tamaşaçıları valeh etdi. Operanın əsas musiqi xətti xalqın qəhrəmanlıq mübarizəsini təcəssüm etdirən aşıq havaları üzərində qurulmuşdur. Operada Koroğlu obrazı xalqın azadlıq mübarizəsini aparan bir lider kimi təqdim olunur və onun qəhrəmanlığı təkcə şəxsi mübarizəsi ilə deyil, xalqın ümumi azadlıq arzusu ilə birləşir.

Bu operada ən təsirli səhnələrdən biri Koroğlunun xalqı üsyana qaldırdığı səhnədir. İlk pərdədə kəndlilərin ağır həyat şəraitini təsvir edən səhnə ilə başlayan tamaşa, Koroğlunun qəhrəmanlıq və azadlıq çağırışları ilə davam edir. Xanın sarayındakı təntənəli səhnələrdə isə musiqi və rəqs vasitəsilə zalım hakimiyyətə qarşı narazılıq və müqavimət ruhu canlanır. Üçüncü pərdədə Çənlibel qalasında toplanan kəndlilərin mübarizəyə qatılması və son pərdədə zalım Həsən xana qarşı qələbə qazanılması operanın dramatik kulminasiyasını təşkil edir.

Bu tamaşa həm musiqi, həm də rejissorluq baxımından çox böyük uğur qazandı. Azərbaycan teatr tarixində bu qədər geniş miqyasda səhnələşdirilən bir operanın nümayişi nadir hallarda rast gəlinən bir hadisə idi. "Koroğlu" operası milli operamızın ən yüksək zirvəsi olaraq qalır və İsmayıl Hidayətzadənin bu əsəri səhnəyə gətirməsi onun Azərbaycan teatr sənətindəki yerini möhkəmləndirən bir amil olmuşdur (Mükərrəmoğlu, 2011).

İsmayıl Hidayətzadə öz rejissor fəaliyyəti ilə Azərbaycan teatrının inkişafına əvəzsiz töhfələr vermişdir. Onun rəhbərliyi altında "Koroğlu" operasının səhnələşdirilməsi Azərbaycan teatrında yeni bir dövrün başlanğıcı oldu. Bu opera, milli musiqi və teatr sənətinin birləşməsinin ən gözəl nümunələrindən biri olaraq Azərbaycan mədəniyyətinin parlaq simvoluna çevrildi.

Hidayətzadənin rejissor olaraq bu əsəri səhnəyə gətirməsi, onun Azərbaycan teatr səhnəsində milli və bəşəri dəyərlərin ifadəçisi kimi böyük uğurlar qazanmasına səbəb oldu. Bu opera Azərbaycan xalqının qəhrəmanlıq mübarizəsinin, azadlıq arzusunun və mədəniyyətinin ən gözəl təcəssümü olaraq gələcək nəsillər üçün əbədi bir dəyər olaraq qalacaq. Operanın yarandığı gündən şərq xalqlarının opera sənətinə inkişafında mühüm töhfə vermiş bu əsər, təbii ki, bundan sonrakı illərdə də opera sənətinin şah əsərlərdən biri kimi qalacaqdır.

## Nəticə

Hidayətzadənin yaradıcılığı Azərbaycan teatrının inkişafına əhəmiyyətli töhfələr verərək, milli irsin yaşadılmasına və müasir kontekstdə təqdimatına imkan tanımışdır. "Yeddi gözəl" tamaşasında qadın müstəqilliyi və daxili gözəlliyin əhəmiyyəti vurğulanır, "Koroğlu" operasında isə xalq mübarizəsi və qəhrəmanlıq mövzuları ön plana çıxarılır. Hər iki əsər, İsmayıl Hidayətzadənin teatr irsini zənginləşdirərək milli kimliyin qorunmasında və gənc nəsillərə mədəni irsin tanıdılmasında əvəzsiz rol oynamışdır. Teatrın estetikası, bədii dərinliyi və folklor elementlərinin istifadəsi tamaşaların mədəni əhəmiyyətini artırmışdır.

## Ədəbiyyat

1. Degen, A., Stupnikov, İ. (2012, 7 noyabr). *60 illik əfsanə: "Yeddi gözəl" baletinin yubeyində.*
2. Həsənova, T. (2023, 17 aprel). *Operamızın Koroğlu abidəsi.* Azerbaijan-News.az. https://www.azerbaijan-news.az/az/posts/detail/operamizin-koroglu-abidesi-1683159075
3. Xudavərdiyeva, T. (2017, 25 dekabr). *Böyük mirasın keşikçiləri.* Kaspiy.az. https://kaspiy.az/straz-velikogo-naslediya
4. Kaldış, Y. (1973). *Musiqi ensiklopediyası. SSRİ-də "Sovet enisklopediyası" və "Sovet bəstəkarı.*
5. *Karayev. Balet "Sem krasavits"*. Belcanto.ru. https://www.belcanto.ru/ballet_seven.html
6. Qriqoroviç, Y. (1981). *Balet enisklopediyası.* Sovet enisklopediyası.
7. Qədirova, N. (2017, 28 aprel). *Və bu gün, uzaq 1937-ci ildə olduğu kimi "Koroğlu".* Millikitabxana.az. https://www.anl.az/down/meqale/kaspi/2017/aprel/540147.htm
8. Qasımov, R. (2023, 3 aprel). *"Koroğlu operası Bakı səhnəsində".* Novayaepoxa.com. https://novayaepoxa.com/opera-keroglu-na-bakinskoy-scene/443313/
9. Mükərrəmoğlu, M. (2011, 14 avqust). *O yaradıcılığını həyatı qədər sevirdi.* Millikitabxana.az. http://anl.az/down/meqale/xalqqazeti/2011/avqust/195240.htm

Folklorun ictimai dəyəri onun idraki, ideya-tərbiyəvi və estetik əhəmiyyətindən ibarətdir. Xalq yaradıcılığının ictimai dəyərini təşkil edən idrak, ideya-tərbiyəvilik və estetik cəhətələr bir-biri ilə sıx şəkildə bağlıdır.

Folklorun idraki əhəmiyyəti hər şeydən öncə real həyat hadisələrinin, xalqın həyat tərzinin xüsusiyyətlərini əks etdirməsində təzahür edir. Sənətdə əks etdirilən həyat həqiqəti ictimai münasibətlər, xalqın əmək və məişəti, yüksək əxlaqi keyfiyyətlər, ölkənin təbiəti və s. haqqında zəngin bilik verir.

Folklorun idraki əhəmiyyətini folklor əsərlərindəki obraz, motiv və süjetlərin insan xarakterlərini, həyat hadisələrini geniş ümumiləşdirməsi və tipikləşdirməsi daha da artırır. Folklorun müxtəlif janrlarının hər biri öz təyinatına uyğun olaraq xalqın həyatında önəmli olan bir mühüm məsələni modelləşdirir. Layla, yatızdırılan uşağa da, layla çalan anaya da ruhi-psixoloji və mənəvi rahatlıq gətirir. Bayatı ayrılıq və həsrət hissini rahatladır, duyğuları səfərbər edərək ağrılı bir mərhələyə keçməsinin qarşısını alır (Kadri Hüseyin Kazım, 1927).

Folklor obrazları çox ümumi və çox tipikdir. Amma bu ümumilik mücərrədlik yaratmadığı kimi, tipiklik də çox fərdilik formalaşdırmağa xidmət etmir. Folklordakı ümumi və tipik obraz xalqın öz obrazıdır. Həmin obrazda xalqın hər bir nümayəndəsinin xüsusiyyəti ümuləşdirilmiş və tipik bir obraza çevrilmişdir. Buradakı insan obrazlarının içərisində yaxşı və pis insanlar var, müsbət və mənfi qəhrəmanlar var. Sehrli personajlar və möcüzəli vasitələr də mənfi-müsbət qütblərinə ayrılırlar. Bu binar oppozisiya (ziddiyət cütlüyü) mifdə xaos-kosmos, ritulda profan-sakral, folklorda isə mənfi-müsbət münasibətləri modelində özünü göstərir (Abbaslı, 2009, s. 78).

Folklorda xalq obrazı əsas və vahid obrazdır. Folklor personajları, insanlar, heyvanlar, quşlar, ağaclar və başqa təbiət hadisələri və digər vasitələr hamısı xalq obrazının tamlığına xidmət edən ünsürlərdir. Xalq obrazı sintaqmatik və paradiqmatik münasibətlər sistemində aydınlaşdırıla və dərk oluna bilər.

Folklorun epik əsərlərində görünən əsas qəhrəmanlar (şah, şahzadə, vəzir, vəkil, cəllad, bağban, ovçu, tacir, sənətkar, zərgər, kəndli, varlı, yoxsul, rəiyyət, qoca, qarı, gənc, qız, oğlan, ağıllı, səfeh, zirəng, tənbəl, sadəlövh, hiyləgər, zalım, mərhəmətli, ədalətli və s.) və qəhrəmana aid xüsusiyyətlər xalqın milli özünəməxsusuluğunu göstərən əsas əlamətlərdir və ya başqa deyilişlə, milli mental xüsusiyyətləridir. Folklor əsərləri bütün sosial təbəqələri təcəssüm etdirir. Burada tam tarixi-mədəni epoxalar və laylar da öz əksini tapa bilir. Məsələn, Şah İsmayıl məhəbbət dastanının qəhrəmanı, Şah Abbas əfsanə və nağıl, Xoca Nəsrəddin lətifə qəhrəmanı olur. Bu qəhrəmanların folklora daxil olması, dövrün motivlənməsi elə həmin mətnlərin özündə izah olunur. Beləliklə, folklorda düşüncəni narahat edən izahsız bir məsələ qalmır. Ona görə də folklorda dərk olunan gerçəklik xalqın düşündüyü həqiqətdir. Xalqın xəyal gücünün maksimum imkanları ilə yaradılan sənətdəki həqiqət onun bütün arzu və istəklərinin həyata keçməsinin, nikbin nəticələrin alınmasının, xoşbəxt sonluğun, sosial harmoniyanın təmin olunmasının əsas ideya-mənəvi qaynağı kimi seçilir (Dorson, 1955).

Xalq yaradıcılığı mütərəqqi ideyalardan, vətənə məhəbbətdən, sülhsevərlikdən ilham alır. Onun yaranışında yalnız pozitiv, mütləq müsbət, maksimum optimist düşüncə iştirak edir. Bundan yaranan əsər də sevgi, gözəllik, nikbinlik, haq və ədalətin qələbəsi ilə dolu olur.

Oğuz yurdu, Oğuz eli, Qazlıq dağı, Gökçə dəniz, Şirvan, Naxçıvan, Ağsu, Qarasu, Kür, Araz, Qarabağ, Aran, Qaradağ, Baba dağ, Şah dağ, Dəmirqapı Dərbənd və s. folklorda vətən obrazını, Azərbaycanın təbiətini əks etdirir. Bu da vətənə təbii gözəllik fəlsəfi mənası qazandırır və onun estetik dərkini təmin edir.

Folklor xalqın milli-mədəni görüşlərini, fəlsəfi baxışlarını, mənəvi dünyasını ifadə edir. Bütün bunlarda folklorun ideya-tərbiyəvi əhəmiyyəti aşkarlana bilir (Gökdemir Gönül, 2003).

## Nəticə

Folklorun estetik əhəmiyyəti ilk öncə onunla şərtlənir ki, o, dil, fikir və bədii düşüncənin əsasında xalqın yaratdığı mükəmməl bir söz sənətidir. Folklor xəyal, təxəyyül, fantaziya və simvolikadan sənətkarlıqla istifadə edərək gerçəkliyi dolayı yolla motivləndirir və onu poetikləşdirir. Bu poetikləşdirmə, sənət yaratma prosesində əsas vəzifəni xalqın bəddi zövqü yerinə yetriri. Yəni

xalqın bədii zövqü folklorun estetik ölçülərini müəyyənləşdirən və modelləşdirən əsas faktor rolunda çıxış edir. Folklor formaları əsrlərlə xalq sənətkarları tərəfindən cilalanıb və estetik ölçülərini sabitləşdirib. Ona görə də folklor estetik hissi, gözəllik hissini, dil, ritm və forma gözəlliyi duyğusunu inkişaf etdirir. Folklorun estetik gücü ədəbiyyat, musiqi, teatr və s. kimi sənət növlərinin inkişafında böyük əhəmiyyət daşıyır. Nizami kimi dahi şairin əsasərlərinin əsas qaynağı folklordur. Füzulinin yaradıcılığında follordan yaradıcı şəkildə istifadə olunur və bu ədəbi ənənə şəklini alır və müasir dövrdə də davam edir. Müasir ədəbiyyatda Sabirin, Cəlilin, Cəfərin, Cavidin, Səmədin, Mir Cəlalın, Bəxtiyarın və başqa onlarla ədibin yaradıcılığında folklor elementləri, motivləri bu və ya başqa şəkildə işlənmişdir. Folklorun az və ya çox dərəcədə ədəbi əsərlərə daxil olması ilk öncə onları zəruri estetik minimumun əsas nüvəsi olan xalq ruhu ilə təmin etmiş olur. Çünki xalq ruhu folklorun hər bir zərrəsində var. Bu zərrələrdən ədəbi əsərdə istifadə olunduqca o əsərlər də xalq ruhunun zərrələri ilə zənginləşərək bir tərəfdən hazır estetik elementlər alır, digər tərəfdən də onları yazıçı düşüncəsi ilə açır, inkişaf imkanlarını aydınlaşdırır, əlavələr edir, yeni keyfiyyət qazandırır və yeni bir estetik aktı, bədii sənət faktını gerçəkləşdirir.

## Ədəbiyyat

1. Abbaslı, İ. (2009). *Folklorşünaslıq*. *Azərbaycan ədəbiyyatı tarixi.* 6 cilddə. I cild. Elm.
2. Akalın, S. (2005). *Alqışlar və qışqırıqlar*. Çapar nəşriyyatı.
3. Çobanoğlu, Ö. (2002). Halkbilimi kuramaları ve Araştırma Yöntemleri Tarihine Giriş [Introduction to the History of Folklore Theories and Research Methods]. Akçag.
4. Dorson, M. Richard. (1955). İngilis folklorşünasın ilk qrupu. *Amerika folkloru jurnalı*, 64, 267.
5. Əfəndiyev, P. (1992). *Azərbaycan şifahi xalq ədəbiyyatı* (dərslik).
6. Gökdemir, G. (2003). *Türk mifologiyasında*. And-And Təşkilatı.
7. Gökdemir Gönül. (2003). Türk mifologiyasının əsasları. *Milli Folklor*, 60, 60-72; TDEA, 1, 136-137.
8. Gökyay Orhan Şaik. (2000). *Dədəm Qorqudun Kitabı*.
9. Xəlil, A. (2006). *Əski türk savlarının semiotikası* [Semiotics of Old Turkic savs]. Səda.
10. İnan Abdülkadir. (1987). Eski Türklərdə ve Folklorda And. Məqalələr və araşdırmalar [Oath in Old Turks and Folklore. Articles and studies].
11. Kadri Hüseyin Kazım. (1927). *Büyük Türk Lüğəti* [Big Turkish Dictionary].
12. Dorson, M. Richard. (1988). *American Foklore*. The University of Chicago Press.

Daxil oldu: 03.09.2024
Baxışa göndərildi: 25.09.2024
Təsdiq edildi: 17.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/76-80

**Günel Əliyeva**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialı
gunelaliyeva0492@gmail.com

# Hərbi sənaye və proqramlaşdırma

**Xülasə**

Hərbi sənaye və proqramlaşdırma, dövlətlərin müdafiə qabiliyyətini artırmaq məqsədilə silahlar, avadanlıqlar və texnologiyalar istehsal edən sektordur. Proqramlaşdırma isə bu texnologiyaların işləməsi, idarə edilməsi və inkişaf etdirilməsi üçün vacibdir. Proqramlaşdırmanın rolu avadanlıq idarəsi, simulyasiya və təlim, məlumat analizi kimi sahələrdə özünü göstərir. Hərbi avadanlıqların proqram təminatı ilə idarə edilməsi, kəşfiyyat məlumatlarının toplanması və analizi üçün proqramların istifadəsi mühüm əhəmiyyət kəsb edir. Təhlükəsizlik və etibarlılıq məsələləri də önəmlidir. Kibertəhlükəsizlik, hərbi sistemlərin proqram təminatının təhlükəsizliyini təmin edir. Eyni zamanda yeni texnologiyaların inkişafı, süni intellekt və avtomatlaşdırma sahələrində irəliləyişlər yaradır. Hərbi sənaye proqramlaşdırma vasitəsilə yeni silah sistemləri və müdafiə texnologiyalarının tədqiqatına investisiya qoyur. Strateji əhəmiyyət baxımından proqramlaşdırma, hərbi strategiyaların hazırlanmasında və icrasında mühüm rol oynayır. Dövlətlər arasında hərbi üstünlüyü təmin etmək üçün proqramlaşdırma və texnologiyanın inkişafı önəmlidir. Nəticə etibarilə, hərbi sənaye və proqramlaşdırma bir-birini tamamlayan sahələrdir. Proqramlaşdırma, hərbi texnologiyaların effektivliyini artırır, təhlükəsizliyini təmin edir və innovasiyaların inkişafını sürətləndirir. Bu əlaqə, müasir dövrdə dövlətlərin müdafiə qabiliyyətini artırmaq üçün kritik əhəmiyyət kəsb edir.

***Açar sözlər:*** *hərbi sənaye, proqramlaşdırma, yeni texnologiyalar, süni intellekt, hərbi mühəndislik*

**Gunel Aliyeva**
Sheki branch of Azerbaijan State Pedagogical University
gunelaliyeva0492@gmail.com

# Military Industry and Programming

**Abstract**

The military industry and programming is the sector that produces weapons, equipment and technologies in order to increase the defense capability of states. Programming, on the other hand, is essential for the functioning, management and development of these technologies. The role of programming is manifested in such areas as equipment management, simulation and training, data analysis. Of great importance is the use of programs for software control of military equipment, collection and analysis of intelligence information. Safety and reliability issues are also important. Cybersecurity ensures the security of the software of military systems. At the same time, the development of new technologies creates breakthroughs in the fields of artificial intelligence and automation. The military industry invests in the research of new weapons systems and defense technologies through programming. From the point of view of strategic importance, programming plays an important role in the development and implementation of military strategies. The development of programming and technology is important to ensure military superiority between states. Consequently, the military industry and programming are complementary areas. Programming increases the effectiveness of military technologies, ensures their safety and accelerates the development of innovations. This connection is of critical importance in modern times to increase the defense capability of states.

***Keywords:*** *military industry, programming, new technologies, artificial intelligence, military engineering*

## Giriş

Hərbi sənaye, dövlətlərin və ya ölkələrin hərbi qüvvələri üçün silahlar, sursatlar, avadanlıqlar və digər hərbi texnologiyaların istehsalı və inkişafı ilə məşğul olan sənaye sektorudur. Bu sahə, həmçinin hərbi tədqiqat və inkişaf fəaliyyətlərini, müharibə və münaqişə zamanı istifadə edilən müxtəlif sistemlərin, alətlərin və xidmətlərin yaradılmasını əhatə edir. Hərbi sənaye müxtəlif məhsulları əhatə edir. Məsələn, tanklar, döyüş gəmi və təyyarələri, raketlər, müxtəlif növ silahlar, mühafizə avadanlıqları və hərbi texnologiyalar.

**Tədqiqat**

Hərbi sənaye ölkənin müdafiə qabiliyyətini artırmaq və təhlükəsizliyi təmin etmək məqsədini daşıyır. Eyni zamanda bu sənaye sektoru beynəlxalq münasibətlərdə də mühüm rol oynayır, çünki ölkələr arasında hərbi texnologiyaların ticarəti və əməkdaşlığı da mövcuddur (Military Innovation in the Interwar Period). Hərbi sənayenin inkişafı və istifadəsi iqtisadiyyat, siyasət və beynəlxalq münasibətlər baxımından geniş təsir göstərə bilər. Hərbi sənaye aşağıdakı sahələri özündə əks etdirir:

**Silah istehsalı:** Tüfənglər, avtomatlar, mərmilər, raketlər və digər silahların istehsalı.

**Sursat istehsalı:** Ammunisiya, mərmilər və müxtəlif növ partlayıcı maddələrin istehsalı.

**Hərbi texnika:** Tanklar, zirehli maşınlar, hərbi avtomobillər, sualtı qayıqlar, döyüş təyyarələri, helikopterlər.

**Hərbi avadanlıqlar:** Radio kommunikasiya sistemləri, radarlar, təsbit və yönləndirmə sistemləri.

**Hərbi mühəndislik və texnologiya:** Kəşfiyyat texnologiyaları, mühafizə sistemləri, pilot avtomatlaşdırma texnologiyaları.

Hərbi sənayenin tədqiqat və inkişafı (R&D), müasir müharibələrin tələblərinə cavab vermək üçün yeni texnologiyaların və sistemlərin yaradılmasına yönəlmiş kritik bir prosesdir. Bu sahə, təhlükəsizlik və müdafiə sahəsində innovasiyaların inkişafını təmin edir. Hərbi sənayenin inkişafı 2 hissəyə bölünür (The Pentagon's Brain: An Uncanny Ability to Predict the Future):

**Yeni texnologiyalar:** Hərbi sənaye, müasir müharibə tələblərinə cavab verən yeni texnologiyaların inkişafını dəstəkləyir.

**İnnovasiyalar:** Süni intellekt, kibertəhlükəsizlik, avtonom sistemlər və digər sahələrdə yeniliklər üzərində işlər aparılır.

Hərbi sənayedə yeni texnologiyaların rolu çox böyük və çoxşaxəlidir. Bu texnologiyalar müasir döyüş mühitini dəyişdirir, hərbi gücün effektivliyini artırır və müharibələrin xarakterini təyin edir. Yeni texnologiyaların hərbi sənayedə roluna aid ilk olaraq **Döyüş bacarıqlarının təkmilləşdirilməsini** misal göstərmək olar. Belə ki, yeni texnologiyalar, döyüşçülərin və hərbi birləşmələrin döyüş bacarıqlarını artırır. Məsələn, inkişaf etmiş döyüş kostyumları, qoruyucu avadanlıqlar və biometrik izləmə sistemləri əsgərlərin təhlükəsizliyini və effektivliyini artırır. Daha sonra **Kəşfiyyat və Monitorinq**. Belə ki, süni intellekt, peyk texnologiyaları və dronlar kimi yeni texnologiyalar kəşfiyyat və monitorinq işlərini daha dəqiq və səmərəli həyata keçirməyə kömək edir. Bu, düşmənin hərəkətlərini izləmək və strateji qərarları dəstəkləmək üçün çox vacibdir. Ən önəmli rol olaraq **Raketlər və Silahları** qeyd edə bilərik ki, burada yeni texnologiyalar raketlərin dəqiqliyini, gücünü və məsafəsini artırır. Məsələn, hipersəs raketləri və lazer silahları, döyüş sahəsində üstünlük əldə etməyə kömək edə bilər. Son olaraq da, **Süni İntellekt və Avtomatlaşdırmanı** misal göstərmək olar. Süni intellekt və avtomatlaşdırılmış sistemlər döyüş əməliyyatlarını daha səmərəli həyata keçirməyə imkan verir. Bu texnologiyalar strateji planlaşdırma, avtonom döyüş sistemləri və məlumat analizi sahələrində istifadə olunur (Programming the Future: Artificial Intelligence and the Military).

**Kibertəhlükəsizlik və Müdafiə:** Kiber hücumlar hərbi infrastruktur üçün ciddi təhdid yarada bilər. Yeni texnologiyalar bu sahədə müdafiə mexanizmlərini gücləndirir və məlumatların təhlükəsizliyini təmin edir.

**Təchizat və Logistika:** Avtomatlaşdırılmış təchizat sistemləri, qabaqcıl logistika texnologiyaları və robotika sahəsindəki yeniliklər hərbi təchizat və logistikanı daha sürətli və effektiv edir.

**Tibbi texnologiyalar:** Yeni tibbi texnologiyalar əsgərlərin müalicəsini sürətləndirir və yaralanmaların daha effektiv şəkildə müalicə edilməsinə imkan tanıyır. Misal üçün, robot cərrahiyyə və inkişaf etmiş ilkin yardım texnologiyaları.

**Psixoloji dəstək:** İnnovativ psixoloji dəstək texnologiyaları əsgərlərin döyüşdən sonra sağlamlığını qorumağa kömək edir.

Bu texnologiyaların hər biri, hərbi əməliyyatların müasirləşdirilməsi və effektivliyinin artırılması baxımından əhəmiyyətlidir. Onlar həm də strateji üstünlük əldə etməyə və düşmənin zəifliklərini hədəfləməyə imkan tanıyır (Machine Learning for Cybersecurity).

Hərbi sənayedə yeni texnologiyalarla yanaşı, innovasiyaların rolu da çox əhəmiyyətlidir və müxtəlif sahələrdə əhəmiyyətli dəyişikliklərə səbəb olur. Bu innovasiyalar həm müasir döyüş mühitini dəyişdirir, həm də hərbi strategiyaların inkişafını dəstəkləyir. Aşağıda hərbi sənayedə innovasiyaların bəzi əsas rolu və təsirləri qeyd edilmişdir:

**1. Döyüş bacarıqlarının artırılması**

**Yeni silah texnologiyaları:** İnnovasiyalar yeni nəsil silahların inkişafına gətirib çıxarır, məsələn, lazer silahları, hipersəs raketləri və avtonom döyüş sistemləri. Bu silahlar daha dəqiq, daha güclü və daha effektiv döyüş bacarıqları təmin edir (Artificial Intelligence and National Security).

**Gelişmiş mühəndislik:** Yeni materiallar və konstruksiya metodları, döyüş texnikalarının daha dayanıqlı və etibarlı olmasına imkan tanıyır.

**2. Kəşfiyyat və monitorinqin təkmilləşdirilməsi**

**Süni İntellekt (AI):** AI və maşın öyrənməsi, kəşfiyyat məlumatlarının analizini daha dəqiq və sürətli edir. Bu, düşmənin hərəkətlərini daha effektiv şəkildə proqnozlaşdırmağa və təhlil etməyə kömək edir.

**Peyk və Dron texnologiyaları:** Gelişmiş peyk sistemləri və dronlar müasir kəşfiyyat və monitorinq fəaliyyətlərini daha geniş və dəqiq həyata keçirməyə imkan tanıyır.

**3. Avtomatlaşdırma və Avtonom sistemlər**

**Avtonom döyüş vasitələri:** Avtonom tanklar, pilotsuz uçuş aparatları (dronlar) və robot döyüşçülər döyüş mühitində insan müdaxiləsini azaltmaq və təhlükəsizliyi artır maq məqsədini güdür.

**Müxtəlif avtomatlaşdırılmış sistemlər:** Əməliyyatların daha effektiv şəkildə idarə olunmasına kömək edən avtomatlaşdırılmış loqistika, təchizat və idarəetmə sistemləri.

**4. Strategiya və Planlaşdırma**

**Simulyasiya və Təlim texnologiyaları:** Yeni simulyasiya və təlim texnologiyaları döyüş təcrübəsini daha realistik və təsirli edir. Virtual və artırılmış reallıq (AR/VR) texnologiyaları əsgərlərin daha yaxşı təlim keçməsinə imkan tanıyır.

**Proqnozlaşdırma və Təhlil:** Gelişmiş analitik alətlər və qərar dəstəkləyici sistemlər strateji qərarların daha dəqiq və məlumatlı şəkildə qəbul olunmasına kömək edir.

**5. İnfrastruktur və Logistika**

**İnnovativ təchizat:** Yeni texnologiyalar və sistemlər təchizatın daha sürətli və effektiv şəkildə həyata keçirilməsinə imkan tanıyır, məsələn, avtomatlaşdırılmış anbar idarəetmə sistemləri.

**Şəbəkə əlaqələri:** Yeni əlaqə texnologiyaları əsgərlərin və hərbi birləşmələrin daha yaxşı əlaqə və koordinasiya etməsini təmin edir (Wired for War: The Robotics Revolution and Conflict in the 21st Century).

Bu innovasiyalar hərbi əməliyyatların daha təsirli və təhlükəsiz olmasına kömək edir, müasir müharibə şəraitində strateji üstünlük əldə etməyə imkan tanıyır. Eyni zamanda hərbi sənayedəki bu inkişaflar digər sahələrdə də, məsələn, mülki texnologiyalarda tətbiq olunan yeni texnologiyaların inkişafına təsir göstərir.

Müasir dövrdə hərbi proqramlaşdırmanın strateji rolu, effektiv qərar qəbuletmədən kibertəhlükəsizliyə, innovasiyalardan birgə əməliyyatlara qədər geniş bir sahəni əhatə edir. Bu sahənin inkişafı, dövlətlərin təhlükəsizlik və müdafiə qabiliyyətini artıraraq müasir müharibələrdə üstünlük təmin edir (The Future of War: A History).

Azərbaycanda 2020-ci ilin 27 sentyabrından 10 noyabrına qədər davam edən 44 günlük İkinci Qarabağ müharibəsi, hərbi sənayenin proqramlaşdırma və texnologiyaların istifadəsinin müasir müharibələrdə nə qədər əhəmiyyətli olduğunu göstərən bir nümunə oldu. Bu müharibədə proqramlaşdırma və texnologiyanın müxtəlif aspektləri aşağıdakı şəkildə özünü göstərdi:

**1. PUA (Pilotlaşdırılmayan Uçuş Aparatları):**

Azərbaycana məxsus olan Bayraktar TB2 və digər PUA-lar müharibədə mühüm rol oynadı. Bu dronlar döyüş meydanında düşmən mövqelərinin kəşfiyyatını aparmaq, dəqiq zərbələr endirmək və düşmənin hərbi infrastrukturlarını hədəf almaq üçün istifadə edildi. Bu dronların proqramlaşdırması və idarəetməsi onların effektivliyini artıran kritik bir faktor oldu. PUA-ların proqramlaşdırılması onların missiyaların dəqiq yerinə yetirilməsinə imkan tanıdı (AI Superpowers: China, Silicon Valley, and the New World Order).

**2. Hərbi intellektual sistemlər:**

Müharibə zamanı intellektual və avtomatlaşdırılmış sistemlərdən istifadə edilməsi təmin edildi. Bu sistemlər arasında müxtəlif növ radarlar, sensorlar və avtomatlaşdırılmış təyinat və idarəetmə sistemləri var idi. Bu sistemlərin proqramlaşdırılması, hədəflərin dəqiq seçilməsinə və real vaxtda məlumatların emalına imkan tanıdı (The New Rules of War: Victory in the Age of Durable Disorder).

**3. Kəşfiyyat və İdarəetmə sistemləri:**

Müharibədə effektiv kəşfiyyat və idarəetmə sistemi quruldu. Bu sistemlər proqramlaşdırılmış proqramlar və alqoritmlər istifadə edərək real vaxtda məlumat toplama, təhlil etmə və qərar qəbul etməyə kömək etdi. Bu, müharibənin dinamik tələblərinə uyğun strateji qərarların daha sürətli və dəqiq qəbul edilməsini təmin etdi.

**4. Kommunikasiya və Koordinasiya:**

Müharibə zamanı istifadə olunan hərbi kommunikasiya sistemləri də proqramlaşdırma əsasında fəaliyyət göstərirdi. Bu sistemlər mütəxəssislərin, komandirlərinin və müxtəlif hərbi birliklərin arasında effektiv əlaqə və koordinasiya təmin edirdi. Proqramlaşdırma və şifrələmə texnologiyaları məlumatların təhlükəsizliyini təmin etdi və müxtəlif hərbi əməliyyatların sinxronizasiya olunmasına kömək etdi.

**5. Sursat və Silahların avtomatlaşdırılması:**

Bəzi silah sistemləri və sursatlar da proqramlaşdırma əsasında fəaliyyət göstərirdi. Avtomatlaşdırılmış sistemlər və zəka alqoritmləri vasitəsilə bu silahlar daha dəqiq hədəfləri vursun və minimum səhv ilə zərbələr endirsin (Army of None: Autonomous Weapons and the Future of War).

**6. Hərbi tədqiqat və İnkişaf:**

Müharibə zamanı hərbi tədqiqat və inkişaf sahəsindəki proqramlaşdırma layihələri də mühüm rol oynadı. Yeni texnologiyaların tətbiqi, mövcud sistemlərin modernləşdirilməsi və optimallaşdırılması müharibə şəraitində üstünlük qazandırdı.

**7. Təhlükəsizlik və Kiber müdafiə:**

Müharibə zamanı kibertəhlükəsizlik də əhəmiyyətli oldu. Proqramlaşdırma və kiber müdafiə sistemləri düşmənin məlumat sistemlərinə hücumlarını dəf etmək və öz hərbi məlumat sistemlərini qorumaq üçün istifadə edildi (The Ethics of Artificial Intelligence and Robotics).

## Nəticə

Müasir müharibələrdə proqramlaşdırma və texnologiyanın rolu getdikcə artmaqdadır. Gələcəkdə hərbi sənaye və proqramlaşdırma daha da inteqrasiya olunacaq. Süni intellekt, maşın öyrənməsi və digər qabaqcıl texnologiyalar hərbi əməliyyatların effektivliyini artırmaq üçün istifadə ediləcək. Bu, döyüş sahəsindəki qərar qəbuletmə proseslərini sürətləndirəcək və daha dəqiq nəticələr əldə etməyə imkan tanıyacaq.

Hərbi sənaye və proqramlaşdırma bir-birini tamamlayan sahələrdir. Proqramlaşdırma, müasir dövrdə hərbi texnologiyaların inkişafını sürətləndirir və təhlükəsizlik sahəsində yeni imkanlar yaradır. Bu sahələrdəki yeniliklər, dövlətlərin müdafiə qabiliyyətini artırmağa kömək edir.

44 günlük müharibə, müasir hərbi texnologiyaların və proqramlaşdırmanın münaqişələrin nəticələrinə necə təsir edə biləcəyini nümayiş etdirdi. Azərbaycanda bu texnologiyaların effektiv

istifadə olunması müharibənin nəticələrinə müsbət təsir göstərdi və bu sahədəki inkişaflar gələcəkdə də əhəmiyyətli olacaqdır.

## Ədəbiyyat

1. National Defense University Press. (n.d.). *Artificial intelligence and national security*.
2. Scharre, P. (2018). *Army of none: Autonomous weapons and the future of war*. W. W. Norton & Company.
3. Lee, K.-F. (2018). *AI superpowers: China, Silicon Valley, and the new world order*. Houghton Mifflin Harcourt.
4. Singer, P. W., & Friedman, A. (2014). *Cybersecurity and cyberwar: What everyone needs to know*. Oxford University Press.
5. Smith, J. S. (2019). *Machine learning for cybersecurity*. Wiley.
6. Murray, W., & Millett, A. R. (2010). *Military innovation in the interwar period*. Cambridge University Press.
7. O'Connell, D. J. (2018). *Programming the future: Artificial intelligence and the military*. Naval Institute Press.
8. Freedman, L. (2017). *The future of war: A history*. PublicAffairs.
9. McFate, S. (2019). *The new rules of war: Victory in the age of durable disorder*. William Morrow.
10. Müller, V. C. (Ed.). (2020). *The ethics of artificial intelligence and robotics*. Springer.
11. Jacobsen, A. (2015). *The Pentagon's brain: An uncanny ability to predict the future*. Little, Brown and Company.
12. Singer, P. W. (2009). *Wired for war: The robotics revolution and conflict in the 21st century*. Penguin Press.

Daxil oldu: 07.09.2024
Baxışa göndərildi: 29.09.2024
Təsdiq edildi: 29.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/81-87

**Khatira Mammadova**
Nakhchivan State University
hxatirem@gmail.com
https://orcid.org/0009-0000-3739-032X

# Steven Krashen's Theory of the Second Language Acquisition

## Abstract

Among modern language teaching methods, the theory of second language acquisition is one of the leading methods. Stephen Krasche's theory of second language acquisition represents an important shift in the way linguists and educators approach language learning. Funded in the 1970s and 1980s, Krashen's model focuses on the idea that language acquisition is a natural and subconscious process that differs from formal language learning. His development comes from the fact that real fluency comes from getting to know the language and mastering it, rather than memorizing grammar rules. At the same time, the educator emphasizes the special diseases of language learners' attention to emotion.

The five main assumptions included in Krashen's theory became teaching in language teaching, shaping methods such as immersion and communicative language teaching, which prioritize natural detail and understanding over rote learning. Krashen's theory emphasizes naturalistic, input-based approaches, and suggests that language learning environments should minimize formal grammar and material in order for my acquisition to work more effectively. Stephen Krashen's second language acquisition process suggests that the second language acquisition process closely mimics the natural language acquisition process found in first language learners. His work challenges several key assumptions about language learning.

***Keywords:*** *language acquisition, appearance, natural order, association, emotional filter*

**Xatirə Məmmədova**
Naxçıvan Dövlət Universiteti
hxatirem@gmail.com
https://orcid.org/0009-0000-3739-032X

# Stefen Kraşenin ikinci dilin mənimsənilməsi nəzəriyyəsi

## Xülasə

Müasir dil tədrisi metodları arasında ikinci dilin mənimsənilməsi nəzəriyyəsi aparıcı üsullardan biridir. Stefen Kraşenin ikinci dilin mənimsənilməsi nəzəriyyəsi dilçilərin və pedaqoqların dil öyrənməsinə yanaşma tərzində əhəmiyyətli dəyişikliyi təmsil edir. 1970 və 1980-ci illərdə işlənib hazırlanmış Kraşenin modeli, dilin mənimsənilməsinin təbii və şüuraltı prosesi olan dilin mənimsənilməsinin formal dil öyrənməsindən fərqli olması fikrinə diqqət yetirir. Onun araşdırması göstərir ki, əsl rəvanlıq qrammatik qaydaları əzbərləməkdənsə, dillə tanış olmaqdan, onu mənimsəməkdən irəli gəlir. Pedaqoq eyni zamanda dil öyrənənlərin emosiyalarınında diqqətə alınmasının xüsusi əhəmiyyətini vurğulayır.

Kraşenin nəzəriyyəsinə daxil olan beş əsas fərziyyə dil tədrisində təməl oldu, immersion və kommunikativ dil tədrisi kimi metodları formalaşdırdı, hansı ki, təbii qarşılıqlı əlaqə və anlayışı əzbər öyrənməkdən üstün tutur. Kraşenin nəzəriyyəsi naturalistik, girişə əsaslanan yanaşmaları vurğulayır və dil öyrənmə mühitlərinin başa düşülən girişə məruz qalmağa diqqət yetirməli və mənimsəməyi daha effektiv dəstəkləmək üçün formal qrammatik təlimatı minimuma endirməyi təklif edir. Stefen Kraşenin ikinci dilin mənimsənilməsi nəzəriyyəsi, ikinci dilin əldə edilməsi prosesinin birinci dili öyrənənlərdə müşahidə olunan təbii dilin mənimsənilməsi prosesini yaxından

 

təqlid etməsini təklif edərək, dil təhsili sahəsinə dərindən təsir göstərmişdir. Onun işi dil öyrənmə ilə bağlı ənənəvi baxışlara meydan oxuyan bir neçə əsas anlayışı vurğulayır.

***Açar sözlər:*** *dilin mənimsənilməsi, müşahidə, təbii nizam, ünsiyyət, emosional filtir*

## Introduction

In the modern world, the interest in learning a second language is increasing day by day. In particular, it is more common among the younger generation. If the demand and enthusiasm for a foreign language increases, a series emerges. Thus, the process of acquiring a second language does not result in the same for every person. While some learners have short-term success, others do not or take longer. There is no amount, the methodology used here is very important. This article will explore the theories of Stephen Krashe, an educator who has put forward key ideas about second language acquisition. Stephen Krashen, professor emeritus at the University of Southern California, was born in Chicago in 1941. PhD in Linguistics, author of articles and books on bilingual education and reading, second language acquisition. Campaigns against anti-bilingual education policies in the state of California concern useful linguists, who are writing articles and organizing events to dispel public misconceptions about bilingual education. It is estimated that Krashe sent more than 1,000 letters to editors protesting what was published in newspapers defending the policy of bilingual education.

**Research**

Steven Krashe's most important contribution to linguistics is his theory of second language acquisition. According to his thinking, the study of grammatical rules and structures, which should be learned through a natural approach, should be abandoned (Krashen’s Theory of Second Language Acquisition: A Practical Approach for English Language Classrooms Nikhitha Raju, 2018). In this case, the second language will give the effect of learning the mother tongue as if it were not another language.

His theory is based on 5 main assumptions. These are:




*Acquisition-Learning Hypothesis.* This is the most basic assumption in Krashe's theory. According to the educator, language acquisition is the way a language learner develops by immersing himself in language skills. This hypothesis is a widely used method among linguists. Krashenin notes that there are 2 different systems in the brain that are independent of each other in the process of learning a second language (The Language Acquisition Mystique: Tried and Found Wanting).

One is natural language acquisition and the other is conscious language learning. To be more precise, according to the teacher, acquisition and learning are different problems. He says that learning happens consciously – the language learner tries to learn about the structure of the

language, to master the grammatical rules. Acquiring is mastering the language and it is a subconscious process. In fact, both ways are learning methods, but the second one is terminologically unacceptable. This is based on the fact that "learning" is an umbrella term and assigning it a limited meaning can lead to confusion. However, a person can achieve a more positive result if he actively replaces what he learns consciously with random learning. According to Krashen, if we compare language learning with language acquisition, it is both a longer process in terms of time, and as a result, it is far from natural spoken language and a slow process. Because, when learning a language, a person who focuses on grammar will acquire a relatively and unnatural spoken language later (Krashen, 1988).

*Monitor hypothesis*. If we want to replace this hypothesis with a more understandable word, it would probably be "observation". This hypothesis actually explains the relationship between natural learning and conscious learning. Krashen says that natural language acquisition exposes the learner to speaking in the second language they are learning. However, when a person consciously learns a language, he becomes his own audience and even editor. A language learner consciously plans the sentence he will make, the words he will choose, and the grammar he will use. But what does Krashen, who does not prioritize grammar when learning a language, mean by this hypothesis?! According to his hypothesis, the monitor hypothesis acts as a kind of polish. That is, this hypothesis helps not to deviate from normal speech. He also divides the monitor users into 3 groups: those who use it excessively, those who use it little, and those who use it in an appropriate way. However, according to Krashe, this hypothesis has a limited function. Therefore, it acts as a monitor and does not contribute to the development of fluency. Krashen says that it is difficult to use the monitor. But if you want to use it successfully, then you should pay attention to 3 conditions (Krashen, 1987):

1) If we consider the grammar monitor, the learner must know the rules. Let's note one nuance, even research linguists admit that they do not know all the rules, they know less than those who write grammatical texts.

Krashen also emphasizes that language teachers do not teach students all grammar rules and students do not learn all the rules taught, even the best students do not remember every rule they learn, and most importantly, even the best students cannot always use the rules they memorize. They often make it difficult to use some rules during the conversation.

2) In addition, attention should be paid to the form and meaning of the constructed sentence. It is not easy to pay attention to both form and meaning at the same time.

3) For most people, the lack of time to use the monitor on a normal conversation basis is a problem. Several linguists can monitor during the conversation, but they must be quite professional.

*Natural order hypothesis*. In fact, the goal is not to master the language in a medical way, so Krashen completely rejects grammar and grammar. According to him, some grammatical knowledge can be learned earlier and some relatively late. For example, anyone can learn the Present Indefinite Tense form faster than the Possessive Noun form (Krashen, 1981). However, the possessive form of the Noun can be considered a simpler grammatical rule. Many factors influence his hypothesis. These include the learner's age, exposure to the language being studied, and first language knowledge.

*Input hypothesis.* This hypothesis explains how a student acquires a second language. If a student is exposed to a level of language that is comprehensible to his/her own, he/she will acquire the second language more quickly. If we explain it in a more comprehensible sentence, people can master the language by understanding the messages given or by receiving understandable information. A greater share falls on the teacher, because he must make sure that the student understands the knowledge he has acquired. A successful outcome is not only realized by understanding what is being said, but at the same time changes in the situation must be followed and mastered. For example, what time was the sentence given or what form did the plural form of the noun take in the constructed sentence, etc. In addition, the most important nuances are to regularly read books, listen to music, watch videos and try to communicate with locals in the language you are learning.

Different methods can be used in English language classrooms to create an atmosphere suitable for comprehensible input.

These methods can be characterized as follows:

The language teacher as the main resource: The teacher is the only living resource available for students' second language (L2) acquisition in the classroom setting. If L2 is the object and medium of instruction, teachers should focus on using more simplified language forms, as well as making the input understandable to learners. they must repeat the language for the teacher should minimize the use of the first language (L1) in the second L2 classroom. This will have a positive effect on the development of their speaking in a foreign language.

Using a wide range of target language experience:

It is important to encourage the student to use versatile external sources such as watching videos or movies, cartoons, reading magazines, newspapers in the target language to gain language access in an unstructured environment.

Chat with native speakers of your target language: You need to communicate with native speakers live or online. This will create a high level of conditions for mastering the second language.

Experiencing different types of reading: The student should be encouraged to use different reading styles. These types of reading can be classified as follows:

– Narrow reading: is the practice of reading a text by an author or about a topic of interest that helps ensure comprehension and natural repetition of vocabulary and grammar (Krashen, 1981).

– Free reading: Free voluntary reading involves the use of extensive reading in language education. At this time, students are free to choose the book they like and read it at their own pace.

– Shared reading: This is an interactive reading experience in which students join or share in the reading of a large book or other extended text, guided and supported by a teacher or experienced reader. This allows students to enjoy material they may not be able to read on their own.

– Interactive reading: This type of reading is a type of reading that is often used in a classroom environment. Interactive reading is ideal for developing students' desire to share their knowledge with classmates or peers. This model allows the reader to bring their own background knowledge to bear on understanding the text.

– Active reading: Active reading is simply reading something with the purpose of understanding it and evaluating it according to your needs.

Apart from all these, forming listening habits is one of the main issues facing the teacher. Apart from the teacher as the source of listening, it is necessary to encourage the student to listen to radio programs in the second language or apply other listening activities. An example of these are audiobooks, which help students understand a concept by listening rather than reading (McLaughlin, 1987).

Cooperative learning is also one of the main methods. So, at this time, by forming small groups of students with different abilities, a very good teaching strategy is applied for the student's L2 understanding. carries, thereby creating an environment for language acquisition.

*The emotional filter hypothesis*. Here, it is emphasized that emotional change has an involuntary role in facilitating the process of second language acquisition. This includes self-confidence, anxiety, motivation (Krashen, 1981). That is, you have to believe that you will succeed in the language you will learn. And this can be achieved with high motivation. In other words, when the negative emotional filter is active, language acquisition is inhibited. That is, the student must be in a free and safe environment to acquire the language. Thus, if the student is affected by affective filters such as low motivation, high level of anxiety, it will be difficult to talk about the targeted result (Krashen, 1994).

On the other hand, although positive affect is necessary for language acquisition, it is not sufficient by itself. There are various methods that can be used in second language classrooms. These are:

Teacher as a motivator. The language teacher's attitude and interest influence the second language classroom environment. A second language teacher should encourage learners in a

developed environment to acquire the language and avoid negative talk about the target language. The teacher should make the classroom activities more accessible to every student in every aspect, thus helping students' motivation and also reducing the level of anxiety.

Language games. Organizing various games in the classroom relieves anxiety and stress, instills self-confidence, and makes the lesson attractive. Games that are applied to topics that seem complicated to students, help them get out of the depressive state (Zafar, 2009, pp. 139-146).

An extracurricular lesson. As a result of language activities organized outside the classroom, the student feels in an informal environment, and in this case, the learning process for a year progresses more effectively.

Positive feedback. Giving positive feedback to a student who speaks in a second language will motivate him even more. Therefore, teachers should be careful when giving oral feedback on the speeches (Mahmudlu, 2022).

Textbook as additional language material. The teacher should use the textbook in such a way that the student's anxiety about difficulties is reduced. This can be partially achieved if the textbook is treated as if it were supplementary material. Here, the teacher's professionalism plays an important role.

Arrangement of non-parameters. It is necessary to create an informal environment in the classroom as much as possible. At this time, the process of acquiring a second language will become easier.

Action-oriented lessons. These types of lessons play an important role in language learning. Because it helps to get more language information from the natural environment. However, it should be taken into account whether the student is an introvert or an extrovert (McLaughlin, 1990, pp. 617-634).

Not to force. The teacher should not force the student who does not want to make a presentation in the second language as much as possible. Because this can lead to the emergence of a number of complexes in the student, which slows down the language acquisition process. An important factor is that the student feels psychologically ready.

Of course, Krashen's theory is subject to a number of *criticisms*. For example, according to Mchlaughlin, Krashen's hypothesis about second language acquisition is not successful, because Krashen did not make the predictions of the hypothesis clear, the empirical basis is weak, and he did not define his conditions precisely. Many critics complain that there is not enough empirical insanity.

Critics argue that Krashen's theory, particularly the Introduction hypothesis, lacks sufficient evidence to support the claims made. According to them, the theory is based mainly on anecdotal evidence and lacks serious experimental confirmation. According to some linguists, it is quite difficult and problematic to separate learners according to their language level (Long, 1996, pp. 413-468).

Krasche's theory is often regarded as an oversimplification of the complex process of language acquisition. Critics argue that his model does not adequately consider factors such as motivation, individual learning strategies, and sociocultural influences. At the same time, Krashen's emphasis on comprehensible information has been criticized for ignoring the role of speech (actively speaking and applying language) in language acquisition. Some argue that language learning involves not only understanding information but also actively using language in meaningful contexts. Critics argue that Krashen's theories have limited practical applications for language teaching.

**A Comparison of Steven Krashe's Second Language Acquisition Hypothesis and Robin Callan's Method of Foreign Language Learning**

If we compare the methods of these two outstanding educators, we can get certain results. First, let's look at Krashe's approach to inclusion and Callan's approach to interaction. Krashen's theory emphasizes the role of comprehensible input as the primary mechanism for language acquisition, while Callan's method advocates interactive communication and an open focus on linguistic form. Regarding the hypothesis of the role of conscious learning, Krashen advocates a more naturalistic

approach, minimizing the role of conscious learning processes, while Callan's method combines explicit instruction and corrective feedback to increase language learning outcomes (Swain, 1995, pp. 125-144).

Callan's method places a strong emphasis on empirical research and evidence-based practices to improve teaching methods and optimize learning outcomes.

This contrasts with Krashen's theory, which is based more on theoretical principles and conceptual frameworks. Much of the criticism about Krashen is about this. From this comparison, we can conclude that Stephen Krashen's second language acquisition hypothesis offers a theoretical framework based on comprehensible input and affective factors, while Robin Callan's method of foreign language learning offers a practical approach that emphasizes interactive communication, open instruction, and learner involvement. Both perspectives provide valuable insights into understanding and improving language acquisition according to different aspects of the complex process of learning a new language.

## Conclusion

In conclusion, we can say that Steven Krashe's second language acquisition hypotheses open a new page in the foreign language learning method. Thus, Krashe's theory emphasizes the importance of comprehensible input, the role of affective factors in language learning, and the natural developmental sequence of language skill acquisition. His hypotheses influenced language teaching methodologies and continue to be an important framework for understanding how individuals acquire second languages.

Krashen's hypothesis emphasizes a naturalistic approach to language learning, advocating exposure to comprehensible input in a supportive and low-anxiety environment. And with these claims, it has been influential in shaping language teaching methodologies and continues to be a reference point for educators and researchers in the field of second language acquisition. Still, there are positive and critical opinions about his hypotheses, which indicates that Krashen's hypotheses are valid and successful.

## References

1. Krashen’s Theory of Second Language Acquisition: A Practical Approach for English Language Classrooms Nikhitha Raju. (2018, December). *International Journal of Innovative Knowledge Concepts*, 6(12), 179-184.
2. Krashen, S. D. (1988). *Second Language Acquisition and Second Language Learning*. Prentice-Hall International.
3. Krashen, S. D. (1987). *Principles and Practice in Second Language Acquisition*. Prentice-Hall International.
4. Krashen, S. D. (1994). *Bilingual education and second language acquisition theory.* In bilingual Education Office (ed.) Schooling and language-minority students: A theoretical framework (2nd ed., pp. 47-75). Evaluation Dissemination and Assessment Center, California State University.
5. Krashen, S. (1981). *Second language acquisition and second language learning*. Pergamon Press.
6. Long, M. H. (1996). The role of the linguistic environment in second language acquisition. *Handbook of Second Language Acquisition*, 2, 413-468. https://doi.org/10.1016/b978-012589042-7/50015-3
7. Mahmudlu, H. (2022). Krashen’s Monitor Model L2 Acquisition. *A Critical Review Journal of Ultimate Research and Trends in Education.*
8. McLaughlin, B. (1990). “Conscious” versus “Unconscious” learning. *TESOL Quarterly*, 24(4), 617-634. https://doi.org/10.2307/3587111
9. McLaughlin, B. (1987). *Theories of second language learning*. Edward Arnold.
10. Swain, M. (1995). *Three functions of output insecond language learning*. In G. Cook, & B.Seidlhofer (Eds.). Principle and practice inapplied linguistics: Studies in honour of H. G. Widdowson, 125-144. Oxford University Press.

11. *The Language Acquisition Mystique: Tried and Found Wanting*. Researchgate.net. https://www.researchgate.net/publication/233577777_The_Language_Acquisition_Mystique_Tried_and_Found_Wanting
12. Zafar, M. (2009). Monitoring the 'Monitor': A Critique of Krashen's Five Hypotheses. *Dhaka University Journal of Linguistics*, 2(4), 139-146.

Received: 23.09.2024
Revised: 11.10.2024
Accepted: 31.10.2024
Published: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/88-93

**Kifayət Mənsimova**
ADPU-nun nəzdində
Azərbaycan Dövlət Pedaqoji Kolleci
kifayetmnv@gmail.com

# İnklüziv təlimin təşkili üsulları haqqında

**Xülasə**

Məqalə təhsil sistemində böyük əhəmiyyət kəsb edən və müstəqil öyrənmə potensialını yüksəldən və hal-hazırda aktuallığı ilə seçilən inklüziv təlimin təşkili üsullarına həsr olunmuşdur. İnklüziv təlim, mənşəyindən və kimliyindən asılı olmayaraq, bütün öyrəncilərin ehtiyaclarını qarşılamaq və onların mövzu ilə qarşılıqlı əlaqəsini dəstəkləyən pedaqogikadır. İnklüziv təlimin təşkili ehtiyac və tələbatların ödənilməsi məqsədilə fəaliyyətin hər bir şagirdin maraq, meyil və tələbatı əsasında təşkil olunması, müxtəlif yolla öyrənən şagirdlər üçün fərqli tapşırıqların, paylama materiallarının hazırlanması, müvafiq təlim mühitinin yaradılması deməkdir. İnklüziv təlimdə müəllimlərin valideynlərlə birgə səyi və əməkdaşlığı sayəsində yaradılan təlim-tədris mühiti təhsilin səmərəliliyini artıra, öyrənmə prosesini daha da təkmilləşdirə bilər. Aydındır ki, ümumtəhsil məktəblərində xüsusi təlim ehtiyacları olan şagirdlərin təhsil alması mümkündür.

Hazırda inklüzivlik beynəlxalq əhəmiyyətə malik olub, müxtəlif rəsmi bəyanatların mühüm tərkib hissəsi kimi çıxış edir. İnklüziv təhsil inteqrasiyadan daha geniş və əhatəli məfhumdur və təhsilə dair bütün məsələləri özündə cəmləşdirir. İnklüzivliyin tərəfdarları şagirdlərin xüsusi təhsil ehtiyaclarının ödənilməsindən daha çox müxtəlifliyi dəstəkləyən və bərabərliyi təmin edən təhsil sisteminin inkişafında maraqlıdırlar.

***Açar sözlər:*** *inklüzivlik, təlim strategiyaları, motivasiya, yaş xüsusiyyətləri, interaktivlik*

**Kifayat Mansimova**
Azerbaijan State Pedagogical College under ADPU
kifayatmnv@gmail.com

# About Organization Methods of Inclusive Education

**Abstract**

The article is devoted to the methods of organization of inclusive education, which are of great importance in the education system and increase the potential of independent learning, which are distinguished by their current relevance. Inclusive learning is a pedagogy that addresses the needs of all learners, regardless of their background or identity, and supports their interaction with the subject-matter. The organization of inclusive education means organizing activities based on the interests, inclinations and needs of each student in order to satisfy needs and requirements, preparing different tasks and distribution materials for students who learn in different ways, and creating an appropriate learning environment. In inclusive education, the educational environment created thanks to the joint effort and cooperation of teachers with parents can increase the efficiency of education and further improve the learning process. It is clear that it is possible for students with special educational needs to study in general education.

Currently, inclusivity is of international importance and acts as an important component of various official statements. Inclusive education is a broader and more comprehensive concept than integration and includes all issues related to education. Proponents of inclusiveness are more interested in developing education system that supports diversity and ensures equality than in meeting the special educational needs of students.

***Keywords:*** *inclusiveness, learning strategies, motivation, age characteristics, interactivity*

 

## Giriş

Qlobal dünyada inklüziv təhsilin reallaşdırılması beynəxalq çağırış kimi qiymətləndirilir. İnklüziv təhsil təhsilə dair bütün məsələləri özündə cəmləşdirir. İnklüzivliyin tərəfdarları şagirdlərin xüsusi təhsil ehtiyaclarının ödənilməsindən daha çox müxtəlifliyi dəstəkləyir və bərabərliyi təmin edən təhsil sisteminin inkişafında maraqlı tərəf kimi çıxış edirlər.

Müəllim şagirdləri gördüyü ilk gündən etibarən inklüziv təlimi həyata keçirməlidir. İnklüzivlik təlim tələbatlarının (şəxsi, mədəni, idraki, fiziki və hissi tələbatlar) nəzərə alınmasıdır. Şagirdlərin fərdi xüsusiyyətlərini müəyyən edən, onları başa düşən müəllim bu tələbatları nəzərə ala biləcək. Pedaqoqlar müxtəlif pedaqoji yanaşma və üsullardan yararlanaraq, uşaqları təlim prosesinə cəlb edə bilərlər. Tələbatlar təlim proqramına uyğunlaşdırılır, istəklər isə (münasib, yararlı olduqda) təmin olunur.

Səmərəli inklüzivliyi təmin etmək məqsədilə müəllim:

- nailiyyət və müvəffəqiyyətin əldə olunmasına şərait yaradır;
- şagirdləri həvəsləndirir, onların hər bir uğurunu qeyd edir;
- müəllim-şagird, şagird-şagird münasibətlərini pozitiv şəkildə qurur;
- təlimi qısa addımlara bölür, həvəsləndirici hədəflər müəyyən edir;
- şagirdlərdə maraq yaradır və onun bütün təlim prosesi boyunca saxlanılmasını təmin edir;
- mütəmadi əks-əlaqə yaradır;
- pozitiv yanaşma həyata keçirir;
- interaktivliyi təmin edir;
- fərdi təlim planı hazırlayır;
- inkişafın mütəmadi izlənilməsi və müvafiq qeydiyyatın aparılmasını təşkil edir;
- şagirdlərin fərdi tələbatlarının təmin olunması məqsədilə müxtəlif təlim resursları hazırlayır.

Beləliklə, şagirdlərin təlimə motivasiyası, marağı artacaq və təlim şagirdlər üçün faydalı olacaqdır.

**Tədqiqat**

İnklüziv təhsil milli təhsil sistemi üçün innovasiyadır, ona görə də hazırkı mərhələdə səriştəli idarəetmə tələb edir. İnklüzivlik termini fransız sözü olub, "daxil etmək" mənsını verir. İnklüzivlik cəmiyyətin bütün üzvlərinin maraqlarını, bütün fəaliyyət növlərində hüquq bərabərliyini təmin etməlidir (Kavale, 2000).

İnklüziv təlimin təşkili strategiyalarının araşdırılmasından əvvəl bu sahədə nəzərə alınacaq şagirdləri və onların təlimə olan tələbatlarını tanımaq önəmlidir. Yəni bu inklüziv təlimi hansı şagirdlərə görə ehtiyac duyuruq və onların nə kimi təlim ehtiyacı var. İnklüziv təlimdə nəzərə alınacaq şagirdləri aşağıdakı formada sıralamaq mümkündür (Zeynalov, 2017):

- görmə (vizual), eşitmə (audiotory) vasitəsilə və hərəki (kinestetik) öyrənənlər (VAK);
- sərbəst-təlim mühitinə cəlb olunmayan şagirdlər;
- davranışla bağlı problemləri olan şagirdlər;
- dislektiklər, yəni oxu və yazıda çətinlik çəkən şagirdlər;
- diskalkuliklər— hesablamada çətinlik çəkən şagirdlər;
- qabiliyyətli və istedadlı – müxtəlif sahələrdə xüsusi bilik və bacarıqlara malik şagirdlər;
- xüsusi təlim ehtiyacları olan – əqli və fiziki imkanları məhdud olan şagirdlər;
- diqqət zəifliyi olan hiperaktiv şagirdlər;
- yaş, cins, din, dil, irqi fərqi olan şagirdlər.

İnklüziv təlim zamanı şagirdlərin mənimsəmə fəaliyyətinə nəzarət imkan verir ki, pedaqoq çətinlik çəkən şagirdlərə müvafiq, lazımi köməyini etsin və istiqamət versin (Losardo, p. 234) Öyrənənlərin təlim ehtiyaclarını müəllim daim diqqət mərkəzində saxlamalı, onları dəstəkləməli, təlim motivasiyalarının artırılması məqsədilə müvafiq tədbirlər görməlidir. Bu məqsədlə lazımi təlim strategiyalarını seçməklə, hər bir şagirdi təlimə cəlb etməklə inklüziv təlim mühiti yaradılmalıdır. Bunun üçün işin pedaqoji tərəfi ilə yanaşı, psixoloji tərəfini də araşdırmalı, bir həkim hər şagird üçün doğru "diaqnoz"u qoymağı bacarmalıyıq. Pedaqoq bütün şagirdlər üçün yaradıcı və innovativ yanaşmalar tətbiq etməli və onların motivasiyasını artırmalıdır (Dewey, 1978)

Bu zaman pedaqoqun işi heç də asan deyil. Yuxarıda sadaladığımız şagird tipləri inklüziv ehtiyacları olan şagirdlərin sadəcə bir hissəsidir və onların ehtiyacları hər zaman eyni olmaya bilər. Pedaqoq daha çox siniflə zaman keçirməklə, əks-əlaqə qurmaqla bu ehtiyacları anlaya bilər və bunu ilk dərsdən edə bilməsi imkansızdır. Lakin bəzi qəlibləşmiş strategiyalardan ilk dərslərdən etibarən istifadə inklüziv təlimin erkən qurulması üçün səmərəli mühit yaradacaqdır. Məsələn, yuxarıda sadaladığımız şagird tiplərindən ilk sırada olan görmə, eşitmə və hərəki yolla öyrənən şagirdlərin təlimdə nəzərə alınması üçün aşağıdakılara diqqət də bilərik:

1. Görmə vasitəsilə öyrənən şagirdlərin təlimdə nəzərə alınması:

− kart və posterlərdən istifadə,
− lövhədə tapşırıqların yazılması,
− açar sözlərin və ya əsas fikirlərin lövhədə qeyd olunması,
− şəkil və diaqramlardan istifadə və onların sözlə izah olunması,
− vizual təfəkkürü inkişaf etdirən sualların verilməsi (məsələn, "Səncə, sxem nəyə bənzəyir?"),
− mətnlə işləmək – bu zaman əsas məqamları vurğulamaq üçün rəngli karandaşlardan, stikerlərdən istifadə edilməsi, paylama materialları, nəzərə çarpan şrift ölçüsündən, yazıda müxtəlif rənglərdən istifadə və s. köməkçi vizual vasitələrdən yararlanmaq.

2. Eşitmə və oxuma vasitəsilə öyrənən şagirdlərin təlimdə nəzərə alınması:

− müzakirələr təşkil etmək,
− şagird və müəllimləri dinləmək,
− paylama materialı, lövhə və posterlərdə (plakatlarda) olan fikirləri müzakirə etmək,
− eşitmə bacarıqlarını inkişaf etdirən suallar vermək (məsələn, "Sizcə, bu ideya necə səslənir ?" və ya "Bu nə deməkdir?"),
− qrup fəaliyyətində düşünmək üçün müəyyən vaxtın ayrılması.

3. Hərəkət (kinestetik fəaliyyət) vasitəsilə öyrənən şagirdlərin təlimdə nəzərə alınması:

− sinif otağının müxtəlif hissələrində fəaliyyətlər təşkil etmək,
− praktiki tapşırıqlar və rollu oyunlar hazırlamaq,
− şagirdlərlə fəaliyyət üçün imkan yaratmaq,
− kinestetik bacarıqları inkişaf etdirən suallar vermək (məsələn, "Bu nəyə bənzəyir?").

Bundan əlavə, inklüziv təlim mühitində təlim ehtiyaclarına görə ən çox rast gəlinən şagird tipləri və onların təlimə olan ehtiyaclarını göstərmək istəyirəm. Bu siyahıya ilk daxil olacaq şagird tipləri diqqət zəifliyi olan hiperaktiv şagirdlərdir. Müasir dövrdə bu tip şagirdlərin sayı durmadan artır və müvafiq tədbirlər görülmədikdə ciddi problemlər yaranır. Hiperaktiv şagirdlərin təlimə marağının təşkil edilməsi üçün onları yayındıran, həyəcana səbəb olan amilləri aradan qaldırmaq və sinifdə pozitiv mühit yaratmaq lazımdır (Salend). Bu məqsədlə:

− onların maraq dairəsində ola bilən materiallar və resurslar hazırlanmalı,
− müstəqil öyrənmək üçün onlara şərait yaradılmalı,
− cütlərlə iş formasından mümkün qədər çox istifadə olunmalı,
− tez-tez əks-əlaqə yaradılmalı,
− çoxlu sayda müxtəlif və fərqli tapşırıqlar tərtib olunmalı,
− daimi fəaliyyət təşkil edilməli,
− aydın paylama materialları hazırlanmalı,
− müvəffəqiyyətlə yerinə yetirilən materiallar müəllim tərəfindən qeyd olunmalıdır.

Hər bir şagirdin təlim ehtiyacları var. Məktəblinin spesifik xüsusiyyətləri öyrənmə prosesinə təsir edir, anlaşmazlıqların yaranması isə problemlərə gətirib çıxarır. Narazı, sərbəst və davranışla bağlı problemləri olan şagirdlərin təlimdə fəal iştirakını təmin etmək, onları təlimə cəlb etmək məqsədilə bir sıra tədbirlərin görülməsi səmərə verə bilər:

− inklüzivliyə cəlb olunmalı şagirdlərin vaxtında müəyyənləşdirilməsi;
− sinifdə çalışan müəllim, eləcə də psixoloq və digər əməkdaşar arasında birgə fəaliyyətin təşkili;
− valideynlərlə işin təşkili və onların şagirdlərlə bağlı məsələlərdə iştirakının təmin edilməsi;

− təlim proqramlarında hər bir şagirdin fərdi xüsusiyyətlərinin, maraq, meyil və tələbatının nəzərə alınması.

Bunlarla yanaşı, müəllim mütəmadi inkişaf dinamikasının monitorinqi aparılmalı, nümunəvi davranış atmosferi qurulmalı, bütün şgirdlərin təlimdə iştirakı təmin olunmalıdır.

Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 3 iyun 2010-cu il tarixli 103 №-li Qərarı ilə təsdiq edilmiş "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları" adlı sənədində pedaqoji prosesin tamlığı, fəaliyyətin stimullaşdırılması, dəstəkləyici mühitin yaradılması əsas prinsiplər kimi müəyyən olunmuşdur (Azərbaycan Respublikasının Nazirlər Kabinetinin Qərarı, 2010). Digər tip uşaqlar isə qabiliyyətli və istedadlı şagirdlərdir. Əksər müəllimlər elə hesab edirlər ki, əgər şagird hər hansı bir fənn üzrə xüsusi istedada malikdirsə, onun təlimdə heç bir dəstəyə ehtiyacı yoxdur. Lakin belə yanaşma doğru deyil. Qabiliyyətindən və ya idrak bacarıqlarından asılı olmayaraq, hər bir şagirdin təlim mühitində qayğıya ehtiyacı var. "Təlim prosesində hər bir şagirdin öyrənmə səviyyəsi nəzərə alınmlıdır", – dedikdə elə sırf bu məsələni anlamaq vacibdir. Dərs sırf zəif anlama qabiliyyəti olan şagirdlər üçün nəzərdə tutulmuş proqram əsasında təşkil olunsa, təlim darıxdırıcı və maraqsız olacaq. Odur ki müəllim təlimin planlaşladırılmasında, təlim nəticələrinin diferensiallaşdırılmasında da digər şagirdlərlə yanaşı, xüsusi qabiliyyət və istedadı olan şagirdləri də nəzərə almalıdır.

Xüsusi qabiliyyətli şagirdlər həmyaşıdlarını inkişafda qabaqlayır və əsas fənnlər üzrə üstün biliklərə sahib olurlar, istedadlı şagirdlər isə incəsənət sahəsində xüsusi bacarıqları ilə seçilirlər (Həmzəyev, 2003).

Qabiliyyətli və istedadlı şagirdlərin xüsusiyyətləri:
− çevik düşünmə,
− sistematiklik,
− yaradıcılıq,
− tez uyğunlaşma,
− çəldlik,
− komandada iş bacarığı.

Təlimdə şagirdlərin maraq, meyil və tələbatlarının ödənilməsi təlim mühitinin onlar üçün daha maraqlı və əlverişli qurulması üçün müəllim müxtəlifliyi təmin etməlidir. Burada müəllim eşitmə, görmə, hərəkəti fəaliyyət vasitəsilə öyrənən şagirdləri nəzərə almalı və müvafiq strategiyalar tətbiq edilməlidir. Şagird tələbatlarının ödənilməsi, təlimdə onların maraqlarının nəzərə alınması motivasiyanın artmasına xidmət edəcəkdir. Hansı şagirdlərlə təlim mühitinin qurulmasından asılı olmayaraq, motivasiya öyrənmənin ən yaxşı formada həyata keçməsinə yaxından kömək edən faktorlardandır (Bauer, 1999).

Şagirdləri həvəsləndirmək üçün aşağıdakı strategiyaları nəzərdən keçirək:
− tədqiqat və araşdırma aparmağa imkan yaradlması,
− açıq tipli sualların verilməsi (Əgər........olsaydı, necə edərdin?),
− müzakirə və debatların təşkili,
− şagirdlərin müstəqilliyinin təmin olunması.

İnklüziv təlim mühitində istifadə edilə biləcək strategiyalar iki kateqoriyaya ayrıla bilər (Norton, Tuitt, 2009):

1. Müxtəlif perspektivləri bir məzmunda birləşdirərək:

*Peşəkar müəllim bunu təlim prosesində rahatlıqla həyata keçirə bilər: şagirdlərin sinifdənxaric oxu proqramına fərqli millətlərdən olan yazıçıların əsərlərini əlavə etməklə, rollu oyunlarda müxtəlif etnik qruplardan olan nümayəndələri təmsil etməklə və ya PowerPoint təqdimatında fərqli insan tiplərindən misallar göstərməklə. Bütün bunların hamısı təlim mühitində peşəkarcasına, diskriminasiyadan uzaq bir formada həyata keçirilməlidir.*

2. Bütün şagirdlərin təlimdə iştiraka cəlb edildiyi inklüziv sinif otağı mühiti yaradaraq:

*Şagirdlərin keçmişini öyrənərək və onların yanaşmaları müvafiq şəkildə uyğunlaşdıraraq, mübahisəli məsələləri müzakirə etmək və inkişaf etdirmək üçün əsas qaydalar müəyyənləşdirərək (və tələbələrə inkişaf etdirməyə kömək etməklə) daha dərin irqi və sosial-iqtisadi fərqliliyə yol aça bilərik.*

İnklüziv təlimin təşkili məqsədilə müəllim ilk növbədə tələbat və ehtiyacları müəyyən etməlidir. Bu, təlimin ilk mərhələsində, məsələn, diaqnostik qiymətləndirmə zamanı intervyu, tapşırıq, müxtəlif fəaliyyətlər zamanı həyata keçirilə bilər. Pedaqoq bir vacib məqamı da nəzərə almalıdır ki, şagirdlər heç də ilk görüşdən öz xasiyyətlərini, iç dünyalarını, fərdi xüsusiyyətlərini büruzə etməyə hazır deyillər və ətrafdakı insanların, yəni müəllim və şagird yoldaşlarının onların hər hansı xüsusiyyətini necə qarşılamasından narahatdırlar. Bunu nəzərə alan müəllim hər şagirdə diqqət göstərməli və həssaslıqla yanaşmalı, eyni zamanda, valideyn, digər müəllim, sinif rəhbəri və psixoloqla iş birliyi qurmalıdır (Vacca, 2000).

Təlim prosesində inklüzivliyin təmin olunması öyrənmənin səmərəsini dəfələrlə artırır. Belə ki, müəllim öz fəaliyyətinə, həmçinin şagirdlərin fəaliyyət və nailiyyətlərinə nəzarət edən zaman aşağıdakı öyrənmə strategiyalarına üstünlük verir:

- Dərsdə eşitmə, görmə və hərəki vasitələrlə öyrənməyə üstünlük verən şagirdlər üçün lazımi metodlardan istifadə;
- Dərsi müvafiq strukturda təşkil etmək: giriş, orta və yekun hissə;
- Müəllim-şagird fəaliyyətin tarazlığını təmin etmək;
- Dərsdə fəallıq göstərən şagirdləri vurğulamaq, bütün şagirdlərin iştirakını təmin etmək;
- Zəif, təlimdə çətinlik çəkən şagirdləri dəstəkləməklə yanaşı, xüsusi qabiliyyətə malik olan şagirdləri daha da həvsləndirmək;
- Təlimdə differensiallaşmanı təmin etmək, təlim nəticələrini şagirdlərin səviyyəsinə uyğun müəyyən etmək;
- Şagirdləri təlimə cəlb etmək üçün maraqlı tapşırıqlardan, interaktiv təlim üsullarından geniş istifadə etmək.

İnklüziv təlimin təşkili ehtiyac və tələbatların ödənilməsi məqsədilə fəaliyyətin hər bir şagirdin maraq, meyil və tələbatı əsasında təşkil olunması, müxtəlif yolla öyrənən şagirdlər üçün fərqli tapşırıqların, paylama materiallarının hazırlanması, müvafiq təlim mühitinin yaradılması deməkdir.

Aşağıdakı cədvəldə inklüzivliyin təmin edilməsi məqsədilə nümunələr verilmişdir.

**Cədvəl**

| Vasitələr | Materiallar |
|---|---|
| Paylama materialları | Materiallar aydın və səlis şəkildə hazırlanmalı, şrift oxuna bilən ölçüdə olmalıdır. |
| Verbal yardım | Müəllim öz təcrübəsindən nümunələr deyə bilər. Sinifdə təmsil olunan milli azlıqlar, müxtəlif din nümayəndələri və s. azlıq təşkil edən şagirdlərin adət-ənənəsi, mədəniyyətindən müxtəlif maraqlı nümunə və misallardan istifadə etmək olar. |
| Yazılı və şifahi nitq | İstər yazılı, istərsə də şifahi nitqdə ədəbi dildən istifadə olunmalı, müxtəlif termin və yeni anlayışların ətraflı izahatı verilməlidir. Terminlərin izahı üçün izahlı lüğətlərdən istifadə olunmalıdır. |
| Vizual yardım | Material və vasitələrdə istifadə olunan rənglərə və onların təsirinə diqqət yetirilməli, mətnlər aydın xətlə, asan oxunula bilən tərzdə yazılmalıdır. |
| Təlim materialları | Müxtəlif təlim materiallarından (elektron və kağız) istifadə olunmalı, şagirdlərin sayına uyğun hazırlanmalıdır. PowerPoint təqdimatlarında şriftin ölçüsünün və rənginin aydın olmasına diqqət yetirilməli, disleksiyalı şagirdlərə yardım məqsədilə sakitləşdirici rəng tonlarından istifadə olunmalıdır. |
| Mühit | Fiziki imkanları məhdud şagirdlərin sinifdə sərbəst və təhlükəsiz hərəkəti üçün avadanlığın münasib şəkildə yerləşdirilməsi, çanta, üst geyimləri və digər əşyaların otağın görünən yerindən uzaq olması diqqət mərkəzində olmalıdır. |
| Davranış | Aqressiv davranış demokratik, humanist üslubla əvəz edilməlidir. |

Qeyd etmək lazımdır ki, sinif otağının təşkili də təlim mühitinə olduqca təsir edən faktorlardandır. Sinif otağı müəllim tərəfindən planlaşdırılan fəaliyyət növlərinə, nəzərdə tutulan qrup işlərinə görə dərsdən əvvəl hazırlanmalıdır. Müxtəlif növ qrup işləri sinifdə fərqli hazırlıq tələb edir. Burada müəllim, qrup işində şagirdlərin, xüsusilə də fiziki imkanları məhdud və ya xüsusi təlim ehtiyacları olan şagirdlərin təhlükəsiz hərəkətini təmin etməli və dərs müddətində onları nəzarət altında saxlamalıdır (Nəzərova, 2023).

Təlim prosesində differensiallaşma qiymətləndirməni də əhatə edir. Belə ki, qiymətləndirmə məqsədilə tərtib olunan testlərdə, istərsə də digər qiymətləndirmə vasitələrində müəllim sinifdə bütün şagirdləri nəzərə almalı, onların inkişaf səviyyəsinə uyğun, müxtəlif çətinlik səviyyəsi olan tapşırıqlar hazırlamalıdır.

## Nəticə

Nəticə olaraq qeyd etmək olar ki, müasir dövrdə hər bir insanın təhsil şansını artıran inklüziv yanaşma ən optimal bir variant olaraq bütün təhsil sistemini əhatə edir. İnklüziv təlimdə həmçinin sağlamlıq imkanları məhdud uşaqların təlimə aktiv şəkildə cəlb olunması böyük əhəmiyyət kəsb edir. Bununla yanaşı, dünya miqyasında geniş yayılan bir təhsil təcrübəsi olması baxımından da aktual məzmun kəsb edir.

Tədqiqatın məqsədi tədris prosesində uşaqların təhsil və təlim ehtiyaclarının ödənilməsini reallaşdırmaqdır.

Beləliklə, müasir cəmiyyətdə sağlamlıq imkanları məhdud şəxsləri effektiv tədris-təlim prosesinə cəlb etmək üçün ictimai səviyyədə maarifləndirici, məlumatlandırıcı işlərin görülməsi, ictimai şüurun formalaşdırılması, həmçinin əlverişli və təhlükəsiz mühit yaradılması prioritet məsələlərdən biridir.

## Ədəbiyyat

1. Həmzəyev, M. Ə. (2003). *Yaş və pedaqoji psixologiyanın əsasları*. Bakı.
2. Nəzərova, Ş. (tərtibçi). (2023). *İnklüziv təhsilin əsasları* (dərslik). Bakı.
3. *Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları*. (2010, 3 iyun). Azərbaycan Respublikasının Nazirlər Kabinetinin Qərarı (№ 103).
4. Zeynalova, N. (2017). *Müasir təhsilin əsasları*. Elm və təhsil.
5. Bauer, A. M. (1999). *How to teach all learners*. Brookes.
6. Dewey, J. (1978). *Democracy and education*. Macmillan.
7. *Inclusive education*. Unicef.org. https: //www.unicef.org/education/inclusive education
8. Kavale, K. A. (2000). *History, rhetoric and reality*. Remedial and Special Education.
9. Losardo, A. Activity-based instruction and direct instruction. *American Journal of Teaching Exceptional Ones,* 88(5), 234.
10. Norton, M., & Tuitt, F. (2009). *Weaving promising inclusive excellence into the higher education classrom*. Oxford University Press.
11. Salend, S. J. *Effective Mainstreaming: Creating inclusiv classrooms.* 3rd edition.
12. Vacca, J. A. (2000). *Reading and learning to read*. 4th edition. Longman.

Daxil oldu: 05.09.2024
Baxışa göndərildi: 30.09.2024
Təsdiq edildi: 12.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/94-96

**Şəbnəm Məmmədova**
Bakı Slavyan Universiteti
m.shabnambsu@gmail.com

# Müasir ingilis və Azərbaycan dilində modallığın ifadə vasitələri

**Xülasə**

Bu məqalə müasir ingilis və Azərbaycan dillərində modalılığın ifadə vasitələrini müqayisə edir. Modalılıq danışanın ifadə etdiyi fikrə və onun obyektiv reallığa olan münasibətini əks etdirən qrammatik-semantik kateqoriyadır. Bu kateqoriya dilin qrammatik sistemində özünü müxtəlif formalarda göstərir və hər iki dildə çoxşaxəli vasitələrlə ifadə olunur. Məqalədə əsas diqqət ingilis və Azərbaycan dillərində modalılığı ifadə edən əsas vasitələrə yönəlir; bunlara modal feillər, intonasiya, fel formaları və söz sırası daxildir. Hər iki dildə bu işarələyicilərin qrammatik strukturlarda necə fərqləndiyi təhlil edilir və onların ifadə xüsusiyyətləri geniş şəkildə araşdırılır. Modal feillərin ingilis dilindəki xüsusi rolu və onların müxtəlif modal çaların ötürülməsindəki funksiyaları ayrıca müzakirə olunur. Müxtəlif modal çaların necə formalaşdığı və ingilis dilində daha geniş spektrdə istifadəsi qeyd olunur. Məqalə, həmçinin Azərbaycan dilində modal ifadələrin dilin quruluşuna uyğun fərqli yollarla necə formalaşdırıldığını əks etdirir və bu fərqlərin dərin qrammatik təhlilini təqdim edir.

***Açar sözlər:*** *modallıq, ifadə vasitələri, modal feillər, intonasiya, vurğu*

**Shabnam Mammadova**
Baku Slavic University
m.shabnambsu@gmail.com

# Ways of Expressing Modality in Modern English and Azerbaijani Languages

**Abstract**

This article compares the means of expressing modality in modern English and Azerbaijani. Modality is a grammatical-semantic category that reflects the speaker's attitude toward the expressed idea and its relationship to objective reality. This category manifests in various forms within the grammatical system of both languages, utilizing a range of linguistic tools. The article focuses on primary modality markers in English and Azerbaijani, such as modal verbs, intonation, verb forms, and word order. It provides a thorough analysis of how these markers function differently across the grammatical structures of each language, offering insight into their unique characteristics. The particular role of modal verbs in English and their function in conveying nuanced modal meanings is given special attention. The article also highlights how modal expressions are structured in Azerbaijani, reflecting the language's unique grammatical framework, with an in-depth examination of these distinctions. This detailed comparison enhances our understanding of how modality is represented across both languages.

***Keywords:*** *modality, ways of expression, modal verbs, intonation, stress*

## Giriş

Modallıq danışanın ifadə olunan fikrə münasibətini, ifadə olunan fikin obyektiv varlığa münasibətini əks etdirən qrammatik semantik kateqoriyadır.

Modallıq anlayışı bütün dillərdə vardır. Çünki modal münasibətsiz danışan öz fikrini tam çatdıra biməz (Hüseynzadə, 1988, s. 105).

Modallıq nitq ünsiyyətinin və ümumiyyətlə, nitq fəaliyyətinin elə bir tərkib hissəsidir ki, onsuz heç bir cümlə tərtib etmək olmaz. Cümlənin üç əsas prinsipial əlaməti vardır (Gordon & Krilova, 1968, s. 98). Predikativlik, bitmişlik intonasiyası və modallıq. Modallıq olmadan cümlədə ifadə

edilən fikir reallaşa bilməz. Danışan öz fikrini reallaşdırmaq üçün modal vasitələrdən istifadə edə bilər.

Modallıq həm fəlsəfi, həm də qrammatik anlayışdır (Aghazade, 1965, s. 61). Fəlsəfədə məntiqi semantik anlayış olaraq modallıq ifadə edilmiş fikrin, mühakimənin əqli ümumiləşdirməyə, çıxarılacaq nəticəyə münasibətini bildirirsə, qrammatik kateqoriya olaraq modallıq danışanın öz fikrinə olan münasibətini ifadə etmək üçün linqvistik formalar və yaxud vahidlər tələb edir. Ona görə dildə modallığın ifadəsi üçün müəyyən formalardan istifadə edilir. Modallıq hər bir dilin öz qrammatik quruluşu əsasında formalaşır. Bu səbəbdən də müxtəlif sistemli dillərdə, o cümlədəndə Azərbaycan və ingilis dillərində modallıq anlayışının ifadəsində istənilən qədər formal fərqə rast gəlmək olar (Abdullayev, 1998).

Azərbaycan və ingilis dillərində modallıq yaradan vasitələrdən geniş istifadə edilir. Azərbaycan dilində modallıq bildirən modal sözlərdən əlavə, ədatlardan və felin müxtəlif formalarından da istifdə etmək olur (Cavadov, 1971, s. 87). Bu, əlbəttə, ingilis dilinə də aid edilə bilər. İngilis dilində isə modallıq bildirən sözlərdən əlavə müxtəlif qrammatik vasitələrdən istifadə edilir. Modallıq haqqında dilçilik ədəbiyyatında çox deyilmiş və yazılmışdır.

Modal çaların meydana çıxmasında intonasiya və fonetik vasitə çox zəngin bir vasitədir. İntonasiya danışanın məqsədi, istək və arzuları ilə əlaqədar olduğundan modallıq bildirir. Modallığa görə məlumat vermə, sual və əmr intonasiyaları fərqləndirilir (Ganshina & Vasilevskaya, 1964).

Modal çalarlıqlı intonasiya dinləyiciyə iradi emosianal cəhətdən təsir göstərmək məqsədi güdür (Adilov).

Modallığı meydana çıxaran vasitələrdən biri də feil şəkilləridir. Feil şəkilləri hal və hərəkətin obyektiv varlığa münasibətini bildirir. Bu münasibət danışan tərəfindən müəyyən edilir və deməli, modallığı ilə səciyyələnir.

Modallıq çalarlığı eyni zamanda sözün sırası ilə də ifadə oluna bilər. Sözün sırasının dəyişməsi ilə subyekiv münasibətdə bu və ya digər cəhətdən dəyişilə bilər. Beləliklə, obyekiv gerçəkliyə, eləcə də söylənilən fikrə münasibət feil şəkillərinin, leksik vahidlərin iştirakı ilə yox, məhz söz sırasının dəyişməsi ilə ortaya çıxa bilir. Başqa sözlə desək, “cümlədə sözlərin müəyyən sıra ilə verilməsi mənanın dəyişməsi, yeni məna xüsusiyyətlərinin əmələ gəlməsinə” gətirib çıxarır (Aghazade, 1965, s. 68).

Sözlərin cümlədə təkrarı ilə də modal çalarlıq ifadə edilə bilər. Cümlədə modal sözlərin fikrin qabarıq çatmasına, daha canlı ifadə ediləsinə və fikirdə emosiyanın qüvvətlənməsinə xidmət edir. Modallığı daha çox leksik təkrarlar əks etdirir (Jesperon, 1954).

Modal məna çalarlığı həmçinin söz birləşmələri və ifadələr vasitəsi ilə də əldə edilə bilir. Bu-raya daxil olan söz qrupları, əsasən, adlarla feillər və adlarla adların birləşməsi nəticəsində meydana gəlib, müxtəlif modal çalarlıq əks etdirir (Zvereva, 1967).

Modal sözlər bir leksik qrammatik kateqoriya kimi əsas nitq hissələri ilə köməkçi nitq hissələri ilə köməkçi nitq hissələri arasında orta mövqe tutur. Əsas nitq hissələrindən təcrid olunaraq xüsusi bir nitq hissəsi kimi meydana çıxır.

Modal sözlər üç cəhətdən semantik, morfoloji və sintaktik cəhətdən səciyyələnir (Gordon & Krilova, 1974):

a) Semantik cəhətdən modal sözlər fikrin varlıqla əlaqəsini və söylənilən fikrə danışanın münasibətini ifadə etmək qabiliyyətinə malikdir.

b) Morfoloji cəhətdən modal sözlər heç bir dəyişikliyə uğramayan bir növ amorflaşmış sözlərdir.

c) Sintaktik cəhətdən modal sözlər cümlənin heç bir üzvi ilə qrammatik əlaqəyə girə bilmir.

Onlar cümlədə tutduqları mövqeyinə baxmayaraq bütövlkdə cümləyə aid olurlar və bu zaman ara söz və ya ara cümlə vəzifəsində çıxış edirlər, modal sözlər söz cümlə kimi də özünü göstərir.

Modal sözlər öz məna xüsusiyyətlərinə görə, əsasən, üç qrupa təsnif edilir: a) zərurilik əks etdirən modal sözlər, b) həqiqilik əks etdirən modal sözlər, c) ehtimallıq əks etdirən modal sözlər.

Modal sözlər tərkibcə aşağıda göstərimiş cəhətlərə görə səciyyələndirilir (Van der Auwera & Plungian, 1998):

a) Vaxtilə müxtəlif nitq hissələrinə aid, indi isə əsas nitq hissələri ilə qrammatik omonimlər yaradanlar.

b) Əsas nitq hissələrindən ayrı dildə yalnız modal söz kimi işlənənlər.

Modal sözlər cümlədə yalnız əlavə modal məna çalarlıqları verməyə xidmət edir.

Modal sözlər və bunlara mənaca yaxın birləşmələr bir birini müəyyən yerlərdə mənaca əvəz edə bilsələr də, onlar bir-biri ilə eynilik təşkil etmir. Onlar, sadəcə olaraq, sinonimdirlər.

Eyni modal söz bir-birinə yaxın müxtəlif məna çalarlığı ifadə edə bilir.

Modal söz cümlə ilə sıx əlaqəyə girir, belə modal sözlər cümlədən çıxarıldıqda, cümlə məzmununu itirə bilir.

Modal sözlər leksik qrammatik kateqoriya və xüsusi bir nitq hissəsi kimi artıq formalaşmışdır.

Müasir ingilis dilində modal feillər məsdərlə birləşərək, hərəkətin mümkünlüyünü, vacibliyini, gərəkliyini, lazımlığını və s. bildirir (Gordon, & Krilova, 1968, s. 68).

Modal feillər adi feillərə xas olan bir sıra qrammatik xüsusiyyətlərə malik deyil:

1. Adi feillərdən fərqli olaraq, indiki zaman qeyri-müəyyən formasında üçüncü şəxs təkdə -s şəkilçisi qəbul etmir.
2. Onların məsdər və analitik formaları yoxdur. Belə feillərə naqi feillər (defektiv) də deyilir.

Müasir ingilis dilində modal feillər bunlardır: can, may, must, shall, will, should, would, ought, need, dare və s.

İngilis dilində modal feillər, adətən, ümumi leksik məna baxımından, morfoloji xüsusiyyətlərinə görə və ümumi sintaksis funksiya daşıdığına görə əsas feillərlə ümumi bağlılığı olur (Palmer, s. 25). Modal feillərin leksik məna xüsusiyyətləri modallığın ifadəsinin müxtəlif çalarlarından, incəliklərindən (zərurət, mümkünlük, arzu və s.) ibarətdir. Bu halda modal feillər hərəkəti deyil, hərəkətə münasibəti bildirir və cümlənin bir sintaksis funksiyasını, modal feillərin xəbər tərkibinin birinci üzvünün funkiyasını yerinə yetirir.

## Nəticə

Modal feillərin leksik mənada genişliyi və mücərrədliyi az və ya çox dərəcədə onların zəif feillər kimi qeyd olunmasına imkan yaradır. Nəticədə isə öz ilkin funksiyasını, xəbər tərkibini saxlayaraq (shall, will, should, would) köməkçi feillər kimi işlənilir. Nəzəri və praktik cəhətdən modal feillər (must, can-could, may-might, shall-should, ought, will-would, need) modallıq ənənəsini davam etdirir.

## Ədəbiyyat

1. Abdullayev, K. (1998). *Azərbaycan dili sintaksisinin problemləri*.
2. Adilov, M. *Azərbaycan dilində sintaktik təkrarlar.*
3. Cavadov, S. (1971). *Azərbaycan dilinin qrammatikası*. I hissə.
4. Hüseynzadə, M. (1988). *Müasir Azərbaycan dili*. III hissə, morfologiya.
5. Aghazade, G. (1965). *Kategoriya nakloneniya v sovremennom Azerbaydzhanskom literaturnom yazyke v plane sootnasheniya s kotegoriyey modal'nosti.*
6. Gordon, E. M., & Krilova, I. P. (1968). *Modality in modern English*.
7. Ganshina, M. A., & Vasilevskaya, N. M. (1964). *English Grammar*.
8. Gordon, E. M., & Krilova, I. P. (1974). *A Grammar of present day English*.
9. Jesperon, O. (1954). *A modern English Grammar.* VI.
10. Palmer, F. R. *Mood and Moodality*. Cambridge University Press.
11. Van der Auwera, J., & Plungian, V. (1998). *Modality's Semantic Map*.
12. Zvereva, Ye. A. (1967). *Modal'nyye glagoly v angliyskom yazyke*.

Daxil oldu: 24.09.2024
Baxışa göndərildi: 12.10.2024
Təsdiq edildi: 02.11.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/97-100

**Jalə Novruzova**
Naxçıvan Dövlət Universiteti
jalenas96@gmail.com

# Riyaziyyat fənninin iqtisadiyyat və mühasibatlıqda rolu

**Xülasə**

Riyaziyyat insanlığın inkişafının təməl daşı olan və həyatımızın hər sahəsində istifadə olunan elmlərdən biridir. Tarix boyunca riyaziyyat yalnız bir elm sahəsi kimi deyil, həm də düşünmə və problemləri həll etmə bacarığı kimi inkişaf etdirilmişdir. Riyaziyyat həyatımızın hər bir sahəsində əhəmiyyətli yer tutur. Riyaziyyat sadəcə rəqəmlər və düsturlardan ibarət deyil; o bizim düşünmə və problemləri həll etmə bacarığımızı inkişaf etdirən, dünyaya fərqli gözlə baxmağımıza kömək edən bir vasitədir. Həyatımızı asanlaşdıran, texnologiyanın inkişafında mühüm rol oynayan riyaziyyatı daha yaxşı mənimsəmək və tədris etmək gələcək üçün böyük əhəmiyyət daşıyır. Riyaziyyat, elmin əsas sütunlarından biridir və müxtəlif sahələrdə geniş istifadə olunur. Riyaziyyat təkcə ədədlərin araşdırılması ilə deyil, həm də həndəsə, cəbr, statistik təhlil və riyazi məntiq kimi mövzuları əhatə edir. Riyaziyyat insanların problem həll etmə qabiliyyətini, məntiqi düşünmə bacarığını inkişaf etdirən elmlərdən biridir. Müasir dövrdə, riyaziyyat texnologiya, mühəndislik, fizika və bir çox digər sahələrdə böyük rol oynayır. Eyni zamanda riyaziyyat beynəlxalq bir dildir. Rəqəmlər, simvollar və riyazi qanunlar bütün dünyada eyni şəkildə anlaşılır.

***Açar sözlər:*** *riyaziyyat, riyaziyyat və iqtisadiyyat, riyaziyyat və mühasibatlıq, hesablama, riyazi analiz*

**Jala Novruzova**
Nakhchivan State University
jalenas96@gmail.com

# The Role of Mathematics in Economics and Accounting

**Abstract**

Mathematics is one of the sciences that is the cornerstone of human development and is used in every field of our life. Throughout history, mathematics has been developed not only as a field of science, but also as the ability to think and solve problems. Mathematics occupies an important place in every area of our lives. Mathematics is not just about numbers and formulas; it is a tool that develops our thinking and problem-solving skills and helps us see the world differently. Better mastering and teaching mathematics, which makes our lives easier and plays an important role in the development of technology, is of great importance for the future. Mathematics is one of the main pillars of science and is widely used in various fields. Mathematics is not only the study of numbers, but also includes topics such as geometry, algebra, statistical analysis and mathematical logic. Mathematics is one of the sciences that develop people's ability to solve problems and think logically. In modern times, mathematics plays a major role in technology, engineering, physics and many other fields. At the same time, mathematics is an international language. Numbers, symbols and mathematical laws are understood in the same way all over the world.

***Keywords:*** *mathematics, mathematics and economics, mathematics and accounting, computing, mathematical analysis*

## Giriş

Riyaziyyat gündəlik həyatımızdan elmi kəşflərə qədər hər sahədə mühüm əhəmiyyətə malikdir. Onun verdiyi analitik düşüncə, məntiqi təfəkkür və problem həll etmə bacarıqları insanlara gündəlik çətinlikləri daha yaxşı anlamağa və həll etməyə kömək edir. Riyaziyyat təhsili alan şəxslər

məlumatı analiz etmək, qərar vermək və problemlərə müxtəlif baxış bucaqlarından yanaşmaqda daha bacarıqlı olurlar. Bundan əlavə, riyaziyyat elmi, texnologiya, mühəndislik və maliyyə kimi sahələrin təməlidir. İnformasiya texnologiyaları, kosmik tədqiqatlar, iqtisadiyyat, hətta tibbdə belə riyaziyyatın rolu əvəzsizdir. Bu sahələrdə inkişaf üçün riyaziyyatın əsaslarını bilmək və onun üzərində qurulan nəzəriyyələri başa düşmək çox vacibdir (Ashlock & Herman, 1970).

**Tədqiqat**

Riyaziyyat elmi iqtisadiyyatın təməl daşı kimi xidmət edir və iqtisadi təhlil, proqnozlaşdırma, modelləşdirmə kimi sahələrdə mühüm rol oynayır. Riyaziyyat iqtisadiyyatın müxtəlif sahələrində tətbiq olunur və iqtisadi qərarların dəqiq və əsaslandırılmış şəkildə verilməsinə imkan yaradır (James).

*Riyazi modelləşdirmə və iqtisadi təhlil*

İqtisadi modellər iqtisadi hadisələri və prosesləri daha yaxşı anlamaq və proqnozlaşdırmaq üçün mühüm vasitədir. Riyazi modelləşdirmə iqtisadçılara real dünyadakı hadisələri sadələşdirilmiş şəkildə göstərməyə və təhlil etməyə imkan verir. Bu modellər iqtisadiyyatın müxtəlif sahələrində, məsələn, bazar tələbi və təklifi, inflyasiya, işsizlik səviyyəsi və ya iqtisadi artım kimi göstəricilərin proqnozlaşdırılmasında istifadə olunur (Kulshishtha).

Bir çox hallarda iqtisadi modellər diferensial tənliklər və ya statistik üsullardan istifadə etməklə qurulur. Məsələn, istehlakçı davranışının təhlilində istifadə olunan tələbin elastikliyi anlayışı riyazi funksiyalarla ifadə edilir. Bu cür modellər iqtisadi proseslərdə baş verən dəyişiklikləri təsvir etmək və iqtisadi siyasətlərin nəticələrini qiymətləndirmək üçün istifadə olunur.

*Ehtimallar və statistika*

Riyaziyyatın iqtisadiyyatda başqa bir əsas tətbiq sahəsi ehtimallar və statistikadır. İqtisadçılar statistik metodlarla böyük məlumatlar üzərində təhlillər aparır, iqtisadi göstəricilərin təhlili, biznes və maliyyə proqnozlarının qurulması, bazar tendensiyalarının müəyyənləşdirilməsi kimi işlərdə riyazi statistikadan geniş istifadə edirlər (Miglani & Singh).

Məsələn, inflyasiya və işsizlik kimi iqtisadi dəyişənlərin proqnozlaşdırılmasında ehtimal nəzəriyyəsi və statistik analizlər çox önəmlidir. Hər bir iqtisadi qərarın qeyri-müəyyənlik elementləri var və ehtimal nəzəriyyəsi bu qeyri-müəyyənliyin modelləşdirilməsində istifadə edilir. Statistik analizlər isə faktiki məlumatları təhlil edərək gələcək üçün proqnozlar verməyə imkan verir.

*Oyun nəzəriyyəsi və rəqabət mühiti*

Riyaziyyatın iqtisadiyyatda tətbiq olunan sahələrindən biri də oyun nəzəriyyəsidir. Oyun nəzəriyyəsi strateji qərarların modelləşdirilməsi və rəqabət mühitində fərqli oyunçuların (şirkətlər, fərdlər və ya dövlətlər) davranışlarının öyrənilməsi ilə məşğul olur. Oyun nəzəriyyəsi iqtisadiyyatda, xüsusilə də biznes və bazar tədqiqatlarında, rəqabət strategiyalarının müəyyənləşdirilməsi və müxtəlif aktorların davranışlarının proqnozlaşdırılması üçün geniş istifadə olunur (Mohsienuddin, 2019).

Məsələn, iki şirkət arasında rəqabət zamanı, onların hər birinin necə hərəkət edəcəyi oyun nəzəriyyəsi vasitəsilə öyrənilə bilər. Burada qərarların optimallaşdırılması üçün riyazi alqoritmlər və metodlar istifadə olunur ki, bu da strateji qərarların daha əsaslı şəkildə verilməsinə imkan yaradır.

*Maliyyə riyaziyyatı*

Maliyyə sahəsində riyaziyyatın rolu xüsusilə böyükdür. Maliyyə riyaziyyatı kapital bazarlarının, investisiyaların və risklərin təhlilində mühüm əhəmiyyət daşıyır. Maliyyə modelləri maliyyə alətlərinin qiymətini təyin etmək, riskləri dəyərləndirmək və gələcək gəlirləri proqnozlaşdırmaq üçün istifadə edilir (Mathematics for Economists).

Misal üçün, səhm bazarlarında qiymətli kağızların qiymətləndirilməsi və ya maliyyə risklərinin idarə edilməsi üçün Black-Scholes modeli kimi riyazi modellərdən istifadə olunur. Bu model maliyyə bazarlarında gələcək qiymətlərin proqnozlaşdırılması üçün geniş tətbiq edilir və iqtisadi qərarların dəstəklənməsi üçün etibarlı vasitədir (Mathematicaloptimization and economic theory).

*Rəqəmsal iqtisadiyyat və böyük məlumatlar*

Müasir iqtisadiyyatda rəqəmsal texnologiyalar və böyük məlumatlar (Big Data) daha çox əhəmiyyət kəsb edir. Böyük məlumatların təhlili riyazi üsullar və alqoritmlər vasitəsilə həyata keçirilir. Bu cür məlumatlar iqtisadiyyatda istehlakçı davranışını təhlil etmək, bazar tendensiyalarını müəyyənləşdirmək və yeni iqtisadi siyasətlər hazırlamaq üçün istifadə olunur (Mathematics for Economists with Applications).

Maşın öyrənməsi və süni intellekt kimi texnologiyalar riyazi alqoritmlər əsasında işləyir və iqtisadi təhlil və proqnozlaşdırmada yeni perspektivlər açır. Böyük həcmli məlumatların idarə olunması və analizi üçün riyazi yanaşmaların tətbiqi iqtisadiyyatın rəqəmsal transformasiyasına güclü təkan verir.

*Qərarların optimizasiyası və rəqəmsal alətlər*

İqtisadiyyatda qərarların optimallaşdırılması riyazi yanaşmalar vasitəsilə həyata keçirilir. İstər resursların səmərəli bölüşdürülməsi, istərsə də maksimum mənfəət əldə edilməsi məqsədi ilə riyazi optimallaşdırma metodları geniş istifadə olunur. Lineyar proqramlaşdırma, kvadrat proqramlaşdırma və digər optimallaşdırma metodları müəssisələrin əməliyyatlarında, istehsal proseslərində və maliyyə planlamasında mühüm rol oynayır (Mathematics OF Accounting and Finance). İqtisadiyyatda riyazi alətlərin istifadəsi qərarların sürətli və dəqiq şəkildə qəbul edilməsinə kömək edir. Bu cür riyazi yanaşmalar resursların daha səmərəli istifadəsinə və iqtisadi artımın təmin olunmasına imkan yaradır.

Mühasibatlıq ixtisasında riyaziyyatın rolu çox böyükdür və bu sahə riyazi bacarıqların əhəmiyyətli istifadəsini tələb edir. Mühasibatlıq, müəssisələrin maliyyə vəziyyətini izləmək, maliyyə əməliyyatlarını dəqiq hesablamaq və təhlil etmək üçün riyaziyyatın müxtəlif sahələrinə müraciət edir (NCERT).

*Əsas maliyyə hesablamaları*

Mühasibatlıq fəaliyyətinin əsas hissəsi maliyyə əməliyyatlarının izlənməsi və dəqiq hesablamaların aparılmasıdır. Gəlir və xərclərin hesablanması, balansların tərtib edilməsi, vergi öhdəliklərinin və maliyyə hesabatlarının hazırlanması kimi proseslər, məhz riyazi metodlara əsaslanır. Əsas əməliyyatlar – toplama, çıxma, vurma, bölmə və faiz hesablamaları mühasibatçının işində daim istifadə olunur.

*Statistik və analitik riyaziyyat*

Mühasibatlıqda maliyyə göstəricilərinin təhlili üçün statistik riyaziyyat vacibdir. Müəssisələrin gəlirlərinin dəyişməsini, xərclərinin artmasını və ya azalmasını, riskləri təhlil etmək üçün statistik metodlar tətbiq olunur. Nəticədə, maliyyə proqnozları tərtib olunur və şirkətin gələcək strategiyalarını müəyyən etmək üçün qərarlar qəbul edilir. Statistik göstəricilərlə işləmək və onları təhlil etmək mühasibat sahəsində vacib bacarıqdır (Roy Hollands, 1990).

*Faiz və dəyişən hesablamaları*

Mühasibatlıqda faiz hesablamaları geniş yayılmışdır. Məsələn, borcların və kreditlərin hesablanması, gəlir və sərmayələrin effektivliyinin təhlili zamanı faizlərdən geniş istifadə olunur. Sadə faiz və mürəkkəb faiz kimi anlayışlar mühasibatçılar üçün gündəlik işlərdən biridir. Bundan əlavə, dəyişən hesablama (differensial və inteqral hesablama) maliyyə axınlarının optimallaşdırılması və gəlirlərin maksimuma çatdırılması üçün tətbiq oluna bilər.

*Büdcə planlaşdırılması*

Riyazi analiz büdcə planlaşdırılmasında mühüm rol oynayır. Mühasibatçılar müəssisələrin gəlir və xərclərini izləyir, büdcəni planlaşdırmaq və tənzimləmək üçün dəqiq riyazi modellərdən istifadə edirlər. Bu prosesdə xərcin gəlirlə müqayisədə necə dəyişdiyini, hansı maliyyə göstəricilərinin müsbət və ya mənfi təsir göstərdiyini anlamaq üçün mühasibatçılar riyazi vasitələrə müraciət edirlər (Skemp, 1971).

*Vergi hesablamaları və hüquqi riyazi məlumatlar*

Vergi qanunvericiliyinə uyğun olaraq, mühasibatçılar müxtəlif vergi növlərini hesablamaq üçün riyaziyyatdan istifadə edirlər. Bu, vergi dərəcələrinin dəqiq tətbiqi və vergi öhdəliklərinin vaxtında və düzgün şəkildə yerinə yetirilməsi üçün vacibdir. Mühasibatlıq sahəsində vergilərin düzgün hesablanması, həmçinin gəlir və xərclərin dəqiq hesabatı üçün kompleks riyazi biliklər tələb olunur.

*Risklərin idarə edilməsi və maliyyə modelləri*

Mühasibatçılar maliyyə risklərini idarə etmək üçün riyazi modellərdən istifadə edirlər. Müəssisənin gələcəkdə maliyyə risklərinə məruz qalmaması üçün risklərin qiymətləndirilməsi və idarə edilməsi vacibdir. Mühasibatçılar bu məqsədlə statistik modellərdən və ehtimal nəzəriyyəsindən geniş istifadə edirlər. Bununla yanaşı, maliyyə modellərinin tətbiqi müəssisənin maliyyə sabitliyini təmin edir (Sonnabend, 1993).

*İnvestisiya təhlili*

İnvestisiya qərarlarının verilməsi mühasibatçılar üçün xüsusi əhəmiyyət daşıyan məsələdir. Mühasibatçılar gəlir və zərəri dəqiq hesablamaq, kapitalın dövriyyəsini və potensial gəlirləri təhlil etmək üçün riyazi metodlardan istifadə edirlər. Onlar investisiyaların gəlirliliyini qiymətləndirmək, kapitalın geri qaytarılması müddətini hesablamaq və investisiya risklərini təhlil etmək üçün faiz və diskontlaşdırma metodlarından istifadə edirlər.

## Nəticə

Riyaziyyat iqtisadiyyatda fundamental bir rol oynayır və onun tətbiqi iqtisadiyyatın müxtəlif sahələrində iqtisadi proseslərin daha yaxşı başa düşülməsinə, proqnozlaşdırılmasına və idarə edilməsinə imkan verir. Riyazi modellər, ehtimallar və statistika, oyun nəzəriyyəsi, maliyyə riyaziyyatı və rəqəmsal iqtisadiyyat kimi sahələrdə riyaziyyatın geniş istifadəsi iqtisadi qərarların dəqiqliyini və effektivliyini artırır. Nəticədə, riyaziyyat iqtisadiyyatda strateji qərarların qəbulunda mühüm vasitə kimi çıxış edir və iqtisadi artıma töhfə verir. Mühasibatlıq sahəsində riyaziyyatın rolu çox geniş və vacibdir. Mühasibatçılar dəqiq hesablama və təhlil bacarıqlarına malik olmalıdırlar, çünki bu biliklər müəssisənin maliyyə sabitliyi və düzgün qərarların qəbul edilməsi üçün əsasdır. Riyazi biliklərin tətbiqi ilə mühasibatçılar müəssisələrin maliyyə məlumatlarını təhlil edir, riskləri qiymətləndirir, maliyyə strategiyalarını hazırlayır və iqtisadi qərarlar qəbul edirlər.

## Ədəbiyyat

1. Ashlock, R. B., & Herman, Jr. W. L. (1970). *Current Research in Elementary School Mathematics*. Macmillan.
2. James, A. *Teaching of Mathematics*. Neelkamal Publication Pvt. Ltd.
3. Kulshishtha, A. K. *Teaching of Mathematics*. R. Lall Book Depot, Meerut-250001
4. Miglani, R. K., & Singh, D. P. *Teaching of Mathematics At Elementary*. Level Part I & Part II. Arya Book Depot Karol Bagh.
5. Mohammad, & Sikender Mohsienuddin. (2019, October 4). Cloud Computing in IT and How It's Going to Help United States Specifically. *International Journal of Computer Trends and Technology (IJCTT)*, 67.
6. *Mathematics for Economists*. Book by Carl P. Simon and Lawrence E. Blume 8.
7. *Mathematicaloptimization and economic theory*. Book by Michael Intriligator.
8. *Mathematics for Economists with Applications*. Book by James Bergin.
9. *Mathematics OF Accounting and Finance*. By Seymour Walton, A. B., C. P. A. Dean of the Walton School of Commerce, Chicago and H. A. Finney, Ph. B., C. P. A. Professor of Accounting, Northwestern University Chicago.
10. NCERT. *Pedagogy of Mathematics*. Textbook for Two-Year B.Ed. Course
11. Roy Hollands. (1990). *Development of Mathematical Skills.* Blackwell Publishers.
12. Skemp, R. R. (1971). *The Psychology of Learning Mathematics*. Penguin Books.
13. Sonnabend, T. A. (1993). *Mathematics for Elementary Teachers* (An Interactive Approach). HBJ Publishers.

Daxil oldu: 11.09.2024
Baxışa göndərildi: 30.09.2024
Təsdiq edildi: 28.10.2024
Çap olundu: 20.11.2024

sahib olmaq istəyən insan gücə sahib olanda ondan mənsub olduğu cəmiyyət üçün istifadə etmək əxlaqını əksər halda itirir. Bilik, bacarıq, qabiliyyət sonda vicdansızlığa, ədalətsizliyə, ləyaqətsizliyə çevrilir. Necə deyərlər, "Alçala-alçala yüksələnləri, yuksələ-yüksələ alçalan gördüm" (Quluzadə, 2009).

## Nəticə

Nə qədər ki, insan özü dünyanın bir hissəsidir, dünya haqqında əsl həqiqət insana bəlli ola bilməz. Binanın içində oturub onun ümumi mənzərəsini seyr etmək mümkün deyil; bunun üçün binadan kənara çıxmaq lazımdır. Həyatın nə olduğunu dərk etmək üçün də ona kənardan nəzər salmaq, həyatla ölümün sərhədində dayanmaq lazımdır. Ölüm haqqında düşünməyən, ölümünü gözü önünə gətirməyən, onu qəlbən yaşamayan adam həyatı qiymətləndirə bilməz, onun ali mənasını dərk edə bilməz. Həyatın mənası ölümün hissi yaşantısı məqamında üzə çıxır. Maddi dünyadan beşəlli yapışanlar, dünya malını həyatın mənasına, ali məqsədinə çevirənlər maddi dünya ilə əkslik təşkil edə bilməzlər, çünki onun içində əriyirlər; ona kənardan baxa bilməzlər və deməli, fəlsəfi təfəkkür səviyyəsinə yüksələ bilməzlər. Maddi dünyanın tələblərinə, “sifarişlərinə” həddindən artıq aludə olanda insan öz ali mənasını unudur.

Ölümün mütləqləşdirilməsi və ancaq fizioloji hadisə kimi başa düşülməsi, həm də tədrici yaxınlaşma kimi deyil, çoxpilləli bir proses kimi deyil, ancaq son məqam kimi anlaşılması – bəsit və sadəlövh yanaşmadır (Mətləb, 2005).

Əslində, bir ömür ərzində nə qədər ölümlərlə rastlaşırıq. İnsan həyatı çoxşaxəli, çoxistiqamətlidir. Hər gün, hər saat neçə-neçə hüceyrələr ölür, yeniləri yaranır. Məqsədlərin yox olması, amalların qırılması, əqidənin dəyişməsi, məhəbbətin ümidsiz sonluqla bitməsi və s. neçə-neçə ölümlər. Eyni zamanda sadalananların əksi olan hadisələr olur ki, bu da insanı həyata bağlayır, yaşam eşqini coşdurur.

Həyat proqnozlaşdırılmış və tədricən həyata keçən müntəzəm, kəsilməz bir prosesdir. Başqa planda yanaşdıqda, həyat ölümə aparan bir yoldur və ömür ölümün realizasiya müddətidir.

## Ədəbiyyat

1. Bayramov, Ə. S., Əlizadə, Ə. Ə. (2003). *Sosial psixologiya*.
2. Əsədov, A. (1992). *İnsan təfəkkürü: qaynaqları, tarixi tipləri, perspektivləri*.
3. Əsədov, A. (1996). *Fəlsəfə nədir, necə yaranmışdır*.
4. Əsədov, A., Nəbiyev, Ç. (2003). *Ölüm bir fəlsəfi hadisə kimi*.
5. Əlizadə, Ə. Ə., Bayramov, Ə. S. (2009). *Psixologiya*.
6. Əsədov, A. (2011). *Alman fəlsəfəsinin tarixi təkamülü*.
7. Əsədov, A. (1996). *Müsəlman düşüncə tərzi*.
8. İmanov, H. (2005). *Fəlsəfə*.
9. Quluzadə, Z. (2009). *Mistika və panteizm*.
10. Quluzadə, Z. (1987). *Fəlsəfə tarixi tədqiqat məsələləri*.
11. Məmmədov, Z. (2000). *Nizami Gəncəvinin düşüncələri*.
12. Mətləb, B. (2005). *İslam fəlsəfəsi ilə tanışlıq*.

Daxil oldu: 01.08.2024
Baxışa göndərildi: 08.09.2024
Təsdiq edildi: 13.10.2024
Çap olundu: 20.11.2024

**TƏBİƏT ELMLƏRİ**

**NATURAL SCIENCES**

https://doi.org/10.36719/2663-4619/108/118-122

**Flora Tağıyeva**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
flora-tagiyeva@mail.ru
**Xatirə Xələfli**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
khalafli@mail.ru
**Cavanşir Rəhimov**
Azərbaycan Tibb Universiteti
fizika üzrə fəlsəfə doktoru
javanshir.rahimov@mail.ru
**Dəstə Qasımova**
Azərbaycan Tibb Universiteti
qasimovadasta@gmail.com
**Pəri İsaqova**
Azərbaycan Tibb Universiteti
isagovap@mail.ru

# Demoqrafik göstəricilərin regional xüsusiyyətləri

**Xülasə**

Məqalədə 2014-2023-cü illər ərzində Azərbaycanda demoqrafik göstəricilərin təhlili aparılmışdır. Məqsəd Azərbaycan Respublikasının timsalında əhalinin demoqrafik göstəricilərinin dinamikasında meydana çıxan əsas regional xüsusiyyətlərin aşkar edilməsi olmuşdur. Müəyyən edillmişdir ki, 2014-cü ildə əhalinin 170 503 nəfəri (əhalinin 1000 nəfərinə görə 18,1) doğulmuşsa, o, getdikcə azalaraq 2023-cü ildə 112 620 nəfər (1000 nəfərə görə 11,1) təşkil etmişdir. Ölənlərin sayı 2014-cü ildə 55 648 nəfər (1000 nəfərə görə 5,9) olmuş, sonra dalğavari şəkildə artıb-azalmış və 2020-ci ildə yenidən artaraq – 45 647 nəfər (1000 nəfərə görə 7,6), 2021-ci ildə – 76 878 nəfər (1000 nəfərə görə – 7,7) olmuşdur ki, bunu Covid-19 pandemiyasının acı fəsadları ilə izah etmək lazımdır. Daha sonra yenidən azalma qeydə alınır.

***Açar sözlər:*** *Azərbaycan əhalisi, demoqrafik göstəricilər, doğuş səviyyəsi, ölüm səviyyəsi, statistik göstəricilər*

**Flora Taghiyeva**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
flora-tagiyeva@mail.ru
**Khatira Khalafli**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
khalafli@mail.ru
**Javanshir Rahimov**
Azerbaijan Medical University
Doctor of Philosophy in Physics
javanshir.rahimov@mail.ru

**Dasta Gasimova**
Azerbaijan Medical University
qasimovadasta@gmail.com
**Pari Isagova**
Azerbaijan Medical University
isagovap@mail.ru

# Regional Peculiarities of Demographic Indicators

**Abstract**

The article analyzes demographic indicators in Azerbaijan for 2014-2023. The goal was to identify the main regional features manifested in the dynamics of demographic indicators of the population using the example of the Republic of Azerbaijan. It was found that 170,503 people were born in 2014 (18.1 per 1,000 people), and in 2023 it gradually decreased to 112,620 people (11.1 per 1,000 people). The death toll was 55,648 (5.9 per 1,000 people) in 2014, then fluctuated and increased again in 2020 to 45,647 (7.6 per 1,000 people), in 2021 to 76,878 (7.7 per 1,000 people), which should be explained by the bitter consequences of the Covid-19 pandemic. Then a decline is recorded again.

***Keywords:*** *population of Azerbaijan, demographic indicators, birth rate, mortality, statistical indicators*

## Giriş

Demoqrafiya problemi qlobal miqyas almışdır. Demoqrafiya – əhali haqqında, onun sıxlığı, hərəkəti, dünyanın müxtəlif regionlarında yerləşməsi, cins, yaş, məşğulluq növünə görə tərkibi barəsində elmdir. Hər şeydən əvvəl, demoqrafiya problemi dedikdə, əhalinin sayının böyük templə yüksəlməsi və insanların artan tələbatlarını təmin etmək zərurəti başa düşülür. Bəşəriyyətin mövcud olmasının uzun müddətli tarixində Yer kürəsində vəziyyət əhəmiyyətli dərəcədə dəyişmişdir. 10 mln il əvvəl, yəni bəşəriyyət istehsalçı təsərrüfat formasına – əkinçilik və maldarlığa keçdiyi vaxt, bizim planetdə cəmi 5 mln.-a yaxın insan yaşayırdı. Bizim əsrin əvvəlində dünyada 250 mln. şəxs yaşayırdı ki, bu da təqribən indiki Müstəqil Dövlətlər Birliyinin ərazisində məskunlaşanların sayına bərabərdir. Təkcə ABŞ vətəndaşlarının (275 mln. nəfər) sayı Yuli Sezarın dövründə Yer kürəsində yaşayan sakinlərin sayı qədərdir (European Health Information Gateway).

**Tədqiqat**

Əhalinin artması prosesi indi də davam edir. 1960-cı ildə o, saatda 8 mln. nəfər, 1980-ci ildə – 10 mln. nəfər, 1990-cı ildə – 12 mln. nəfər sürətlə gedirdi. Lakin ayrı-ayrı ölkələrdə və dünyanın müxtəlif regionlarında əhalinin artması qeyri-bərabər baş verir. Bəzi yerlərdə o, demoqrafik partlayış xarakterini almış və insanları ərzaqla, dərman preparatları, həyat üçün vacib olan vasitələrlə lazımınca təmin etməmək təhlükəsini yaratmışdır. Haradasa, əksinə, əhalinin sayının xeyli dərəcədə azalması baş verir. Demoqraf-alimlərin proqnozlarına görə Afrika qitəsinin əhalisi, hansı ki, indi Yer kürəsi əhalisinin 12 %-ni təşkil edir, XXI əsrin ortalarına doğru 2050-ci ildə artıq 20 %-i keçə bilər, Avropa ölkələrinin əhalisinin sayı isə (indi 13 % təşkil edir), əksinə, bu vaxta qədər 7 %-ə qədər enə bilər (Kovalev, 2018).

XVIII əsrin sonunda Avropa ölkələrində ümumilikdə tibbi xidmətin səviyyəsi yüksəlmişdir. Ölüm göstəricisi azalmağa başlamış, ancaq doğum göstəricisi əvvəlki səviyyədə qalmışdır. Bu, əhalinin sayının artmasına gətirib çıxarır. Lakin XX əsrin ortalarına doğru bu ölkələrdə doğum göstəricilərinin enməsi baş vermişdir ki, nəticədə, təbii artım xeyli azalmışdır (Dahlberg & Andersson, 2018). Dünyanın aparıcı, inkişaf etmiş ölkələri hazırda əhalinin sayının kəskin dərəcədə azalması problemi ilə üzləşmişdir. Çox nadir ailələrdə bir uşaqdan artıq uşaq doğulur. Çoxları heç uşağın olmasını belə istəmirlər: ya müasir mürəkkəb dövrdə uşağın tərbiyəsi üçün məsuliyyəti öz üzərlərinə götürmək istəmirlər, ya da sərbəst gəzintiyə çıxmaq, diskoteka və klublarda əylənmək arzulayır, yaxud da sağlamlıq vəziyyətinə görə uşaq sahibi ola bilmirlər. Halbuki bu ölkələrdə insanların həyat şəraiti kifayət qədər firavandır (Smith & Jennifer, 2019). Əhalinin hər nəfərinə görə

istehsal olunan məhsulun səviyyəsi, məsələn Böyük Britaniyada 1999-cu ildə, demək olar ki, 24 min ABŞ dolları təşkil etmişdir (Ukrayna ilə müqayisə edin – orada analoji göstərici cəmi 590 dollar; Rusiyada isə – 1410 ABŞ dollardır).

İnkişaf edən ölkələr statusunu alan ölkələr üçün digər mənzərə səciyyəvidir. Onlarda XX əsrin ortalarında tibb xidmətinin keyfiyyəti əhəmiyyətli dərəcədə artmışdır. Bununla yanaşı, doğum səviyyəsi yüksək olaraq qalmışdır və nəticədə əhalinin sayının artma tempi çox yüksək olmuşdur. Demoqrafik partlayış adlandırılan problem bəşəriyyətin ən mühüm başlıca problemlərindən biridir. Bir qayda olaraq, əhalinin təbii artımının yüksək göstəriciləri iqtisadiyyatı zəif inkişaf etmiş ölkələr üçün səciyyəvidir, belə ki, orada dövlət insanların normal həyat şəraitini təmin edə bilmir (Budarin & El'bek, 2022). Bu ölkələrdə kəskin ərzaq qıtlığı hiss olunur, minlərlə insan aclıqdan əzab çəkir. Hökumət torpaqların eroziyası, yəni yer qabığının axar sular və ya buz təsiri ilə dağılması prosesi, meşələrin vəhşicəsinə qırılması ilə mübarizə aparmaq imkanına malik deyildir.

Afrika qitəsində xüsusilə təhlükəli vəziyyət yaranmışdır (Pham & Vo, 2019). Alimlərin proqnozlarına görə, yaxın onillikdə bir sıra Afrika ölkələrinin (Namibiya, Mozambik, Botsvana) yaşlı əhalisinin üçdə biri QİÇS-dən (Qazanılmış immun çatışmazlıq sindromu) öləcəkdir. Yoxsulluq, savadsızlıq, ənənəvi icma halında yaşama tərzi Afrika əhalisini QİÇS təhlükəsi qarşısında gücsüz qoymuşdur. CAR-da 1998-ci ildə QİÇS hər on fəhlədən birinin ölümünün səbəbi sayılmışdır. Hazırda Afrikada, müxtəlif fikirlərə görə, QİÇS virusunun gəzdiriciləri 23 mln.-dan 100 mln.-a yaxın şəxsdir, onların müalicəsinə sərf olan vəsait ildə 50 mlrd. dollardan 200 mlrd. dollara qədərdir. Təbiidir ki, belə böyük məbləğ qitədə sadəcə olaraq yoxdur, necə ki, bu xəstəliklə mübarizə aparmaq üçün genişmiqyaslı proqramların həyata keçirilməsi üçün vəsaitlər yoxdur.

QİÇS və qitədə şölənən tayfalararası münaqişələr Afrikanın sənaye iqtisadiyyatının qalıqlarını məhv edir, mövcud dövlət sərhədlərinin dağılmasına gətirib çıxarır. Dünyanın aparıcı ölkələrində hələlik «Qara qitə»nin xilas olunmasına dair heç bir təyinat yoxdur. Lakin artıq bu gün aydındır ki, heç bir halda xarici müdaxilə olmadan Afrika bəşəriyyət tarixində ən böyük demoqrafik fəlakətdən yaxa qurtara bilməz.

Bəzi Asiya ölkələrində də, məsələn, Hindistanda da mürəkkəb demoqrafik vəziyyət yaranır. Artıq bir çox illər ərzində bu ölkələrin hökuməti doğum artımı göstəricisini nəzarət altında saxlamağa çalışır, hind qadınları arasında ailənin planlaşdırılması və onun vacibliyi haqqında izahedici işlər aparırlar. Lakin bu fəaliyyət nəticəsində alınmış nailiyyətlər haqqında danışmaq hələ tezdir. Bir çox hind ailələri daha çox uşaq doğmağa çalışırlar: belə hesab edirlər ki, uşaqlar heç olmazsa, ehtiyac və kasıbçılıq şəraitində öz valideynlərinin qayğısına qala bilərlər. Uşaqlar nə qədər çoxdurlarsa, işçi qüvvəsi də bir o qədər böyükdür (Nenko, Briga, & Micek, 2022).

Əksinə, Çin Xalq Respublikasında (əhalisinin sayı 1 mlrd. nəfərdən çoxdur) həyata keçirilən siyasət – doğuşun məhdudlaşdırılması son dərəcə müvəffəqiyyətli və səmərəli təcrübədir. Hər bir ailə bir uşaq doğmaq hüququna malikdir. Əgər valideynlər ikinci uşaq tərbiyə etmək istəyirlərsə, onda onlar dövlət xəzinəsinə xeyli böyük məbləğ keçirməlidirlər. Məntiqlik və düşünülmüş demoqrafiya siyasəti sayəsində müasir Çində əhalinin artması nəzarət altına alınmışdır və artıq yaxın illərdə ÇXR dünyanın ən çoxsaylı dövləti səviyyəsindən enərək, birinci yeri Hindistana verəcəkdir.

Doğuş səviyyəsinə mühüm təsir göstərən əsas amillərə – cütlüklərin uşaqlarının olması istəyi (o, cəmiyyətdə dominantlıq edən dini və ya sosial normaların, eləcə də ailə ənənələrinin təsiri altında formalaşır) aiddir. Çoxuşaqlılıqdan orta saylı uşaqlara, sonralar isə azuşaqlılığa keçid – yeni reproduktiv normaların (əvvəlki nəsillərdən ötürülən və müasir reallıqda korreksiya olunan) qəbul edilməsi hesab edilir (Sanderson & Scherbov, 2020). Lakin ailədə uşaqların sayına həmişə uşaqların doğulması normalarının tipi təsir göstərir.

Afrikanın bir sıra ölkələri istisna olunmaqla, dünyanın bir çox ölkələrində doğuş səviyyəsinin qlobal azalması meyli müşahidə edilir (Khalafli, 2014). Azərbaycanda da həmçinin bu meyil nəzərə çarpır – yenidoğulmuş uşaqların sayı azalır ki, bu da respublika üçün xarakterik deyildir (Ümumi məlumatlar, ana ölümü, körpə ölümü; Əhalinin xəstələnməsi altbölmələri, 2024).

**Tədqiqatın məqsədi** – Azərbaycan Respublikasının timsalında əhalinin demoqrafik göstəricilərin dinamikasında meydana çıxan əsas regional xüsusiyyətlərin aşkar edilməsi olmuşdur.

## Material və metodlar

Tədqiqat işinin aparılmasının gedişində Azərbaycan Respublikasının əhalisinin əsas demoqrafik göstəriciləri (ortaillik sayı, doğuş, ölüm səviyyəsi, təbii artım) öyrənilmişdir. İnformasiya mənbələri Azərbaycan Dövlət Statistika Komitəsi, Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin İnformatika və Statistika İdarəsi tərəfindən təqdim edilmiş rəsmi saytlardan alınmış məlumatlar olmuşdur (Azərbaycanda demoqrafik göstəricilər altbölməsi, 2024, s. 48, 52, 59, 64). Əldə edilən məlumatların əsasında Azərbaycan əhalisinin bir sıra statistik göstəriciləri (əhalinin ortaillik sayı, doğuş səviyyəsi, artım templəri, ölüm səviyyəsi) təhlil edilmişdir.

## Nəticələr və onların müzakirəsi

Dövlət Statistika Komitəsinin məlumatlarına əsasən, 2024-cü ilin yanvar-mart ayında Azərbaycanda 24 min 526 uşaq doğulmuşdur. Onlardan 828 əkiz və 39 üçəm doğulmuşdur. Keçən ilin müvafiq dövrü ilə müqayisədə əhalinin 1000 nəfərinə görə doğuş səviyyəsi 11,1-dən 9,7-ə qədər enmişdir. Eyni zamanda göstərilən dövr ərzində ölkədə 15 645 ölüm hadisəsi qeydə alınmışdır. 2023-cü ilin analoji dövrü ilə müqayisədə ölüm göstəricisi 1000 nəfərə görə 6,7-dən 6,2-ə qədər azalmışdır (Təbib bülleteni, 2023; Təbib bülleteni, 2024).

Azərbaycanda doğumun ən yüksək zirvəsi 2014-cü ilə düşmüşdür – bu zaman 17 503 uşaq dünyaya gəlmişdir. Həmin vaxtdan etibarən yenidoğulmuşların sayı hər il azalır, 2023-cü ildə bu göstərici 112 620 uşaq təşkil etmişdir. Doğuşun azalması həm şəhərlərdə, həm də kənd yerlərində müşahidə olunur. Bununla eyni vaxtda Azərbaycanda koronavirus pandemiyasının başlanmasından sonra yüksək ölüm göstəriciləri saxlanmışdır: 2019-cu ildə – 55 916, 2023-cü ildə – 60 150 nəfər ölmüşdür.

2023-cü ildə əhalinin təbii artımı 2022-ci illə müqayisədə 15 %-ə qədər azalmışdır. Bununla yanaşı, son 10 ildə də həmçinin əhalinin ümumi qocalması meyli qeyd olunur. Ölkənin 10,8 %-dən çox əhalisi hazırda 65 yaşdan yuxarı olan şəxslərdir və bu, qoca əhalisi olan (7-8 %) xarici ölkələrin göstəricilərindən yüksəkdir.

## Nəticə

Müasir dövrdə aparılan demoqrafik siyasət əhalinin doğuş səviyyəsinin və ömür müddətinin artmasına, ölüm səviyyəsinin azalmasına, daxili və xarici miqrasiyanın tənzimlənməsinə və əhalinin sağlamlığının qorunub saxlanmasına və möhkəmlənməsinə, bunun əsasında ümumilikdə ölkədə və onun regionlarında demoqrafik vəziyyətin yaxşılaşmasına yönəldilməlidir.

## Ədəbiyyat

1. *Azərbaycanda demoqrafik göstəricilər altbölməsi*. (2024). https://www.stat.gov.az/menu/6/statistical_yearbooks/-
2. *Təbib bülleteni*. (2023, dekabr, yanvar). Tabib.gov. https://tabib.gov.az/media/bulleten/
3. *Təbib bülleteni*. (2024, oktyabr). Tabib.gov. https://tabib.gov.az/media/bulleten/
4. *Ümumi məlumatlar, ana ölümü, körpə ölümü; Əhalinin xəstələnməsi altbölmələri.* (2024). https://www.stat.gov.az/source/healthcare
5. Budarin, S. S., & Elbek, Yu. V. (2022). Effektivnost' funktsionirovaniya sistem zdravookhraneniya, kak predmet gosudarstvennogo finansovogo kontrolya: obzor rossiyskogo i zarubezhnogo opyta. *Problemy sotsial'noy gigiyeny, zdravookhraneniya i istorii meditsiny*, 30, 976-982. https://dx.doi.org/10.32687/0869-866X-2022-30-s1-976-982
6. Dahlberg, J., & Andersson, G. (2018). Changing Seasonal Variation in Births by Sociodemographic Factors: A Population-Based Register Study. *Human Reproduction Open*, 4(015), 1-8. https://doi.org/10.1093/hropen/hoy015
7. *European Health Information Gateway*. http//geteway.euro.who.int
8. Khalafli, Kh. N. (2014). Rasprostranennost' kishechnykh parazitov sredi detskogo naseleniya Baku. *Zhurnal «Problemy sotsial'noy gigiyeny, zdravookhraneniya i istorii meditsiny»*, 4, 47-51.
9. Kovalev, S. P. (2018). Gosudarstvennyy kontrol' i regulirovaniye v sfere zdravookhraneniya v epokhu tsifrovoy ekonomiki. *Upravlencheskoye konsul'tirovaniye*, 2(4), 53-62.

10. Nenko, I., Briga, M., & Micek, A. (2022). From January to June: Birth Seasonality Across Two Centuries in a Rural Polish Community. *Scientific Reports*, 12. Article: 18579. https://doi.org/10.1038/s41598-022-22159-3
11. Pham, T. N., & Vo, D. H. (2019). Aging Population and Economic Growth in Developing Countries: A Quantile Regression Approach. *Emerging Markets Finance and Trade.* https://doi.org/10.1080/1540496X.2019.1698418
12. Smith, C., & Jennifer, T. (2019). Sunshine, Fertility and Racial Disparities. *Economics & Human Biology,* 32, 18-39. https://doi.org/10.1016/j.ehb.2018.10.002
13. Sanderson, W., & Scherbov, S. (2020). New Approaches to the Conceptualization and Measurement of Age and Ageing. *Developments in Demographic Forecasting*. S. Mazzuco, N. Keilman (eds.). Springer. https://doi.org/10.1007/978-3-030- 42472-5_12

Daxil oldu: 05.08.2024
Baxışa göndərildi: 12.09.2024
Təsdiq edildi: 03.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/123-126

**Aygün Məmmədova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
mammadova.aygun1981@gmail.com
**Sevinc İsmayılova**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
ismayilova.sevinc1982@gmail.com
**Nuranə Hüseynova**
Azərbaycan Tibb Universiteti
doktor_tagiyeva@rambler.ru
**Fəxriyyə Əmrahova**
Azərbaycan Tibb Universiteti
dc.fexriyye@mail.ru

# Perinatal risk amillərinin uşaqlarda bətndaxili infeksiyaların klinik gedişinə təsiri

**Xülasə**

Məqalədə bətndaxili infeksiya ilə doğulan erkən yaşlı uşaqların sağlamlıq vəziyyətinə dair qısa məlumatlar verilmiş və son illər bu problemin öyrənilməsi üzrə əldə edilən uğurlar və təcrübə paylaşılmışdır. Bətndaxili infeksiya ilə doğulan erkən yaşlı uşaqların xəstələnmə səviyyəsinin öyrənilməsi göstərir ki, müvafiq olaraq vaxtında və vaxtından əvvəl doğulanlarda tənəffüs orqanlarının xəstəlikləri (56,3 ± 4,9 % və 62,8 ± 7,4 %), qan və qanyaradıcı orqanların xəstəlikləri (34,0 ± 4,7 % və 30,2 ± 7,0 %), infeksion xəstəliklər (35,0 ± 4,7 % və 23,3 ± 6,4 %), sinir sisteminin xəstəlikləri 24,3 ± 4,2 %, 27,9 ± 6,8 % statistik dürüst artmışdır ($p<0,001$). Bətndaxili infeksiyanın ağır forması ilə doğulan uşaqların orqanizminin morfofunksional xüsusiyyətlərini aşkar etmək məqsədilə kompleks müayinələrin aparılması vacibdir. Bətndaxili infeksiya ilə doğulan uşaqlarda xronik patologiyaların formalaşmasını nəzərə alaraq, bu uşaqlar dispanser qeydiyyata alınmalıdırlar.

***Açar sözlər:*** *bətndaxili infeksiya, müalicə, reabilitasiya, erkən yaşlı uşaqlar, letallıq, yayılma*

**Aygun Mammadova**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
mammadova.aygun1981@gmail.com
**Sevinj Ismayilova**
Azerbaijan Medical University
Doctor of Philosophy in Medicine
ismayilova.sevinc1982@gmail.com
**Nurana Huseynova**
Azerbaijan Medical University
doktor_tagiyeva@rambler.ru
**Fakhriya Amrahova**
Azerbaijan Medical University
dc.fexriyye@mail.ru

# Effect of Perinatal Risk Factors on the Clinical Course of Intra-Uterine Infections in Children

## Abstract

The article provides brief information on the health status of premature children born with intrauterine infection and shares the successes and experience gained in the study of this problem in recent years. The study of the morbidity level of premature children born with intrauterine infection shows that respiratory diseases (56,3 ±4,9 % and 62.8 ± 7.4 %), diseases of blood and bleeding organs (34 ,0 ± 4,7 % and 30,2 ± 7,0 %), infectious diseases (35,0 ± 4,7 % and 23,3 ± 6,4 %), nervous system diseases 24,3 ± 4,2 %, 27,9 ± 6,8 % increased statistically honestly (p<0.001). It is important to carry out complex examinations in order to reveal the morphofunctional characteristics of the body of children born with a severe form of intrauterine infection. Taking into account the formation of chronic pathologies in children born with intrauterine infection, these children should be registered at the dispensary.

***Keywords:*** *intrauterine infections, treatment, rehabilitation, early-aged children, lethality, prevalence*

## Giriş

Azərbaycan Respublikasının səhiyyəsinin prioritet istiqamətlərindən olan səhiyyənin inkişafı və əhaliyə göstərilən tibbi xidmətin keyfiyyətinin yüksəldilməsi hər zaman aktual olaraq qalır (Ağayev, 2020, s. 164; Khalafli, 2014, p. 112). Neonatologiya və pediatriyanın ən mürəkkəb və vacib tibbi sosial problemlərindən biri də anadangəlmə infeksion patologiya ilə doğulan uşaqlardır (Arora, 2017, p. 561). Bətndaxili infeksiyaların (BDİ) rastgəlmə tezliyi dəqiq müəyyən edilməmişdir, lakin bir sıra müəlliflərin fikrincə, 10 %-ə qədər rast gəlinə bilər (Tagiyeva, 2024, s. 4360; Carvalho, 2021, p. 24). Bətndaxili infeksiya nəinki perinatal və postnatal itkilərə səbəb olur, həmçinin sonrakı yaş dövründə uşaqların sağlamlığında ciddi dəyişikliklər inkişaf edə bilir ki, bu da uşağın həyat keyfiyyətinin azalmasına və sosial dezadaptasiyasına gətirib çıxara bilər (Khalafli, 2024, p. 10; Samitova, 2016, p. 99). Bətndaxili infeksiyalar erkən yaşlı uşaqların əksəriyyətində psixomotor inkişafın ləngiməsi, uşaq serebral iflici, xroniki somatik xəstəliklər, anadangəlmə qüsurları kimi əlilliyə gətirib çıxaran xəstəliklərin inkişafına səbəb olur (Bortolotti, 2021, p. 6317; Yan, 2016, p. 1455).

Hazıradək bətndaxili infeksiya keçirmiş uşaqların erkən yaşda sağlamlığın kompleks qiymətləndirilməsinə həsr olunmuş xarici ədəbiyyatlarda məlumatlar bir-birinə ziddir və əksər hallarda az müşahidələrə əsaslanmışdır (Maki, 2016, p. 414; Tantengco, 2019, p. 1796; Britt, 2020, p. 7). Buna görə də bətndaxili infeksiya keçirmiş uşaqların inkişaf xüsusiyyətlərinə, patologiyalarının xarakter və strukturuna, immun cavabına, psixi funksiyaların bərpa olunmasının öyrənilməsinə həsr edilmiş həm elmi, həm də təcrübi tədqiqatlara böyük ehtiyac vardır.

**Tədqiqat**

Tədqiqat işinə hamiləliyin 27-42 hestasiya həftəsindən doğulan 234 uşaq cəlb edilmişdir. Əsas qrupa daxil edilən bətndaxili infeksiya ilə doğulan 158 uşaq hestasiya yaşından asılı olaraq 2 yarımqrupa bölünmüşdür: vaxtında doğulan 110 uşaq – 2A yarım qrupu, vaxtından əvvəl doğulan 48 uşaq – 2B yarım qrupu. Nəzarət qrupuna daxil edilən bətndaxili infeksiyanın klinik-laborator əlamətləri olmayan, praktik sağlam olan 76 uşaq hestasiya yaşından asılı olaraq 2 (1A və 1B) yarımqrupa bölünmüşdür.

Müayinədə iştirak edən hər bir uşaq üçün anamnezi, klinik diaqnozu (xəstəliyinin dinamikası və nəticəsi), müayinə və müalicənin nəticələri əks olunan xüsusi yenidoğulanın tibb kartası və katamnestik kartalar hazırlanmışdır. Əsas qrupa daxil olan bütün uşaqlarda anamnestik, klinik-laborator və instrumental müayinələrlə (qanın ümumi, biokimyəvi, seroloji müayinəsi, sidiyin, nəcisin müayinəsi) yanaşı, bətndaxili infeksiyaların törədicilərinin verifikasiyası məqsədilə PZR (polimeraza zəncirvari reaksiyası) və M, G sinif spesifik immunqlobulinlər immunferment analizi metodu ilə edilmişdir.

BDİ olan analarda qan və qanyaradıcı orqanların xəstəlikləri (60,8 ± 3,9 %) və tənəffüs orqanlarının xəstəlikləri (43,7 ± 1,1 %) nəzarət qrupu ilə müqayisədə daha çox hallarda rast gəlir (p<0,001). Digər patologiyalardan həzm sistemi orqanlarının xəstəlikləri 8,2 ± 2,2 %, cinsi yolla keçən xəstəliklər 11,4 ± 2,5 %, endokrin sistemin xəstəlikləri 3,2 ± 1,4 % halda rast gəlinmişdir. BDİ olan anaların hazırkı hamiləliyin gedişi zamanı daha çox hamiləliyin birinci yarısında qusma (67,1 ± 3,7 %), peeklampsiya (23,4 ± 3,4 %), hamiləliyin II trimestrində amnion mayesinin patologiyası (13,3 ± 2,7 %), plasentar çatışmazlıq (6,3 ± 1,9 %) yüksək statistik dürüstlüyü ilə qeydə alınmışdır (p<0,001).

Cərrahi doğuşların faizi əsas qrupda 32,9 ± 3,7 %, nəzarət qrupda isə 18,4 ± 4,4 %. (χ2=5,32, p<0,05). Anamnestik məlumatlardan aydın olur ki, abortlar (7 ± 2,0 %), düşüklərin olması (17,7 ± 3,0 %), ölü doğuşlar 10,1 ± 2,4 % halda rast gəlinmişdir (p<0,05). Anaların orta yaş həddi 27,7 ± 0,47 % təşkil edirdi. BDİ olan analarda anamnezin təhlili göstərir ki, ölü doğuşların və düşüklərin, qan və qanyaradıcı, tənəffüs orqanları və cinsi yolla keçən xəstəliklərin, hestasiyanın birinci yarısında qusmanın, preeklampsiyanın, amnion mayesinin patologiyalarının səviyyəsinin yüksək olması daha çox rast gəlir.

BDİ ilə vaxtında doğulan oğlan və qızların doğulduqda bədən çəkiləri, orta hesabla, 3,1 ± 0,1 kq, orta bədən uzunluğu oğlanlarda 50,8 ± 0,2 sm, qızlarda isə 50,2 ± 0,5 sm olmuşdur. BDİ olan vaxtından əvvəl doğulanların orta hesabla bədən çəkisi oğlanlarda 2,1 ± 0,1 kq və qızlarda 1,9 ± 0,1kq, bədən uzunluğu orta hesabla oğlan və qızlarda müvafiq olaraq 42,8 ± 0,8 sm və 42,8 ± 1,0 sm olmuşdur. Stasionara daxil olan 2B qrupundan vaxtından əvvəl doğulan 27 uşağın vəziyyəti (56,3 ± 7,2 %) çox ağır, 14 uşağın (29,2 ± 6,6 %) isə ağır qiymətləndirilmişdir. 2A qrupunda vaxtında doğulan uşaqların əksəriyyətinin vəziyyəti – ağır 54 uşaq (49,1 ± 4,8 %) və çox ağır 45 uşaq (40,9 ± 4,7 %) olmuşdur. Preaqonal vəziyyətdə vaxtından əvvəl doğulan 7 uşaq (14,6 ± 5,1 %) və vaxtında doğulan 9 uşaq (8,2 ± 2,6 %) daxil olmuşdur. Xəstələrin bu qrupunda xəstəlik ağır formada bütün orqan və sistemlərin zədələnməsi ilə özünü büruzə vermişdir. Yenidoğulanların əksəriyyətində eyni vaxtda 4 üzvün zədələnməsi nəzərə çarpmışdır: 2A qrupunda 57,3 ± 4,7 % və 2B qrupdan 66,7 ± 6,8 %. BDİ olan vaxtında doğulan və vaxtından əvvəl doğulan uşaqlar arasında isə 1-3 üzv zədələnməsi müvafiq olaraq 42,7 ± 4,7 % və 33,3 ± 6,8 % aşkar edilmişdir. Müayinə qruplarında stasionar müalicə 2A qrupunda orta hesabla 14,3 ± 0,9 gün, 2B qrupunda 18,3 ± 2,2 gün davam etmişdir.

Neonatal dövrün gedişinin xüsusiyyətlərinin təhlili göstərmişdir ki, BDİ olan vaxtından əvvəl doğulanlar üçün ağır vəziyyətdə doğulma səciyyəvidir. Belə ki, 14,6 ± 5,1 % vaxtından əvvəl doğulan uşaq, vaxtında doğulan uşaqların isə 5,5 ± 2,2 % ağır asfiksiyada doğulmuşdur. Əsas qrupda vaxtından əvvəl yenidoğulanlarda orta dərəcəli tənəffüs çatışmazlığı tədricən həyatının 1-2-ci saatında ağır tənəffüs çatışmazlığına keçmişdir. Ağciyərlərin süni ventilyasiya apparatına vaxtından əvvəl doğulanlarda 10,4 ± 4,4 % və vaxtında doğulan uşaqlarda 11,8 ± 3,1 % halda ehtiyac duyulmuşdur. Arterial hipoksemiyanın korreksiyası məqsədilə aparılan oksigenterapiya 2B qrupunda 47,9 ± 7,2 %, 2A qrupunda 52,7 ± 4,8 % uşaqda aparılmışdır. Ağciyərlərin CPAP metodu ilə qeyri-invaziv ventilyasiyası 2A qrupundan 15,5 ± 3,4 %, 2B qrupundan isə 29,2 ± 6,6 % uşaqda həyata keçirilmişdir.

Beləliklə, BDİ-nın ağır formaları olan yenidoğulanlar asfiksiya vəziyyətində doğulur və həyatının ilk dəqiqələrindən intensiv erapiyanın və reanimasiyanın aparılmasına ehtiyac duyurlar, əksəriyyətində isə müxtəlif serebral və tənəffüs pozğunluqları meydana çıxır ki, bu da həm uşağın həyatının ilk dəqiqələrindən, həm də bütün neonatal dövrü ərzində respirator dəstək metodlarının tətbiq edilməsinə zərurət yaradır.

## Nəticə

Bətndaxili infeksiya ilə doğulan erkən yaşlı uşaqların xəstələnmə səviyyəsinin öyrənilməsi göstərir ki, müvafiq olaraq vaxtında və vaxtından əvvəl doğulanlarda tənəffüs orqanlarının xəstəlikləri (56,3 ± 4,9 % və 62,8 ± 7,4 %), qan və qanyaradıcı orqanların xəstəlikləri (34,0 ± 4,7 % və 30,2 ± 7,0 %), infeksion xəstəliklər (35,0 ± 4,7 % və 23,3 ± 6,4 %), sinir sisteminin xəstəlikləri 24,3 ± 4,2 %, 27,9 ± 6,8 % statistik dürüst artmışdır (p<0,001). Bətndaxili infeksiyanın ağır forması

ilə doğulan uşaqların orqanizminin morfofunksional xüsusiyyətlərini aşkar etmək məqsədilə kompleks müayinələrin aparılması vacibdir. Bətndaxili infeksiya ilə doğulan uşaqlarda xronik patologiyaların formalaşmasını nəzərə alaraq, bu uşaqlar dispanser qeydiyyata alınmalıdırlar.

## Ədəbiyyat

1. Ağayev, İ. Ə., Xələfli, X. N., Tağıyeva, F. Ş. və b. (2020). Azərbaycanda infeksion xəstə-lənmənin yekun göstəricilərinin qiymətləndirilməsi. *Azərbaycan Tibb Jurnalı.*
2. Arora, N., Sadovsky, Y., Dermody, T. S., et al. (2017). Microbial Vertical Transmission during Human Pregnancy. *Cell. Host. Microbe*.
3. Britt, W. J. (2020). Human Cytomegalovirus Infection in Women With Preexisting Immunity: Sources of Infection and Mechanisms of Infection in the Presence of Antiviral Immunity. *J. Infect. Dis.*
4. Bortolotti, D., Gentili, V., Santi, E., et al. (2021). Late-onset intrauterine growth restriction and HHV-6 infection: A pilot study. *J. Med. Virol.*
5. Carvalho, A. A., Silva, C. B., Martins, M. L., et al. (2021). Congenital cytomegalovirus infection in twin pregnancy. *BMJ Case Rep.*
6. Khalafli, Kh., et al. (2024). History of the development of epidemiology as a general medical science. *Nature and Science: International Scientific Journal.*
7. Khalafli, Kh. N. (2014). Medical and social significance of intestinal parasitoses in the child population of Azerbaijan. *Journal Russian Bulletin of Perinatology and Pediatrics.*
8. Maki, Y., Furukawa, S., Kodama, Y., et al. (2016). Preterm labor and neonatal sepsis caused by intrauterine Helicobacter cinaedi infection. *J. Infect. Chemother.*
9. Samitova, E. R., Ermak, T. N., Koltunov, I. E., et al. (2016). Vnutriutrobnaya pnevmotsistnaya infektsiya [Intrauterine Pneumocystis infection]. *Ter Arkh.*
10. Tagiyeva, F., Rahimov, J., Khalafli, Kh., et al. (2024). Analysis of Biostatistical Indicators by Years in Azerbaijan. *Lobachevskii Journal of Mathematics.*
11. Tantengco, O. A., & Yanagihara, I. (2019). Current understanding and treatment of intra-amniotic infection with Ureaplasma spp. *J. Obstet. Gynaecol. Res.*
12. Yan, S. F., Liu, X. Y., Cheng, Y. F., et al. (2016). Relationship between Intrauterine Bacterial Infection and Early Embryonic Developmental Arrest. *Chin. Med. J. (Engl).*

Daxil oldu: 25.08.2024
Baxışa göndərildi: 14.09.2024
Təsdiq edildi: 22.10.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/127-133

**Şəmil Mahmudov**
Naxçıvan Dövlət Universiteti
kimya üzrə fəlsəfə doktoru
shemilmahmudov@ndu.edu.az
**İsgəndər Mehdiyev**
Naxçıvan Dövlət Universiteti
mehdiyev56@mail.ru

# Metal–lantanid rabitəli metalkomplekslərinin təbii seolit səthinə çökdürülməsi prosesinin tədqiqi

**Xülasə**

Tədqiqat işində müəyyən edilmişdir ki, üzvi həlledicidə həll edilmiş lantanid tərkibli bəzi keçid metallarının kompleksləri $[(OC)_5M]_3Ln$ (burada: M – keçid metalı: Mn, Re; Ln – lantanid metal, Gd, Lu) təbii seolit səthinə çökdürülməsi prosesi tədqiq edilmişdir. Bunun üçün qadolinium (renium) pentakarbonilmanqan (renium) metalkompleksləri sintez edilərək tədqiq edilmişdir. Alınmış $[(OC)_5M]_3Ln{\cdot}NaX$ – seolit solvat tərkibli birləşmələr əvvəlcə 80-100$^0$C, sonra isə 200–350$^0$C-yə qədər qızdırılır ki, bu da kompleksin tam desolvatasiyasını və dekarbonilləşməsini (– CO) və müvafiq intermetallid-seolit tərkibli daha aktiv mərkəzli katalitik sistemin yaranmasını təmin edir. Müasir katalizin problemlərindən biri də yeni daha aktiv katalitik sistemlərin alınması üçün metalkomplekslərin daşıyıcılar səthinə üzvi həlledicilərlə çökdürülməsi üsulundan istifadə olunması imkanlarının araşdırılmalarının aparlımasıdır.

***Açar sözlər:*** *lantanid, seolit, metalkarbonil, metalkompleks, katalitik, hidrogenləşmə, THF*

**Shamil Mahmudov**
Nakhchivan State University
Doctor of Philosophy in Chemistry
shemilmahmudov@ndu.edu.az
**Isgandar Mehdiyev**
Nakhchivan State University
mehdiyev56@mail.ru

# Research of Depocition Process of Metallanthanoid Bond Metalcomplexes on Natural Zeolite Surface

**Abstract**

In the article deposition process of lanthanoid containing some transition metal complexes, which were dissolved at organic solvent, $[(OC)_5M]_3Ln$ (where: M – transition metal; Mn, Re; Ln – lanthanide metal; Gd, Lu) on natural zeolite surface was researched. Gadolinum (rhenium) pentacarbonylmanganese (rhenium) metalcomplexes were synthesized and researched. The obtained $[(OC)_5M]_3Ln$ (NaX – zeolite solvate containing complexes first heated till 80–100$^0$C, then till 200–350$^0$C. This provides fully desolvatation and decarbonyling of the complexes and formation of corresponding intermetallide – zeolite containing more active centered catalytic system. One of the problems of modern catalysis is to investigate the possibilities of using the method of depositing metal complexes on the surface of carriers with organic solvents to obtain new, more active catalytic systems.

***Keywords:*** *lanthanide, zeolite, metalcarbonyl, metalcomplex, catalytic, hydrogenation, THF*

## Giriş

Məlumdur ki, bir sıra keçid metallarının, məsələn, karbonil kompleksləri $(OC)_mM_n$ (burada M = Fe, Co, Ni, Cr, Mo, Mn, Re və s.; n = 1,2; m = 5-10) asanlıqla nadir-torpaq elementləri ilə

 

(lantanidlərlə) ümumi formulu $[(OC)_mM_n]_3Ln$ (burada Ln = La, Gd, Sm, Yb, Lu və s.) olan lantanid tərkibli metalkompleksləri əmələ gətirmək qabiliyyəti göstərirlər (Suleymanov, 1983).

Digər tərəfdən, lantanid tərkibli metalkomplekslərinin vacib xassələrindən biri onların həll olduqları həlledicilərin qaynama temperaturlarında dekarbonilləşməyə çevrilə bilmələridir (Suleymanov, 1986). Bu tip birləşmələr çox aşağı təzyiq və temperaturlarda molekulyar hidrogeni ($H_2$) akkumuluasiya edərək $M_3Ln(H)_k$ (burada k = 20-56 hibrid ion ($H^-$) iki və daha çox funksional qruplu üzvi birləşmələri yüksək selektivliklə katalitik hidrogenləşməsini həyata keçirməyə imkan verir (Imamota, 1984).

Odur ki lantanid tərkibli $[(OC)_mM_n]_3Ln$ metalkomplekslərinin sintezinin sadə və baha olmayan metodlarının mövcudluğu, bu komplekslər əsasında daha aktiv və selektiv katalitik hidrogenləşdirmə sistemlərinin yaradılmasına şərait yaradır. Məsələn, $LMCl_2$ (burada L – bis (amino) piridil – üzvi liqandlı, M = Fe, Co, Ti, V, Cr) komplekslərinin; əvvəlcə $AlR_3$-lə işlənmiş daşıyıcısı $SiO_2$ səthinə çökdürülməsi nəticəsində alınmış yüksək modullu alüminium silikat Al:Si (30:60) təbii seolit daşıyıcılı Ln-M/seolit katalitik sistemi, yüksək aktivlik göstərərək etilenin xətti polimerləşməsini həyata keçirməyə imkan vermişdir (Britorsek, 1998).

Çökdürmə yolu ilə katalitik sistemlərin hazırlanmasının daha geniş yayılan üsulu, keçid metallarının bis (amino) piridil üzvi liqandlı metalkomplekslərinin oksid tərkibli daşıyıcılar səthinə əvvəlcə 60-80$^0$C temperatur intervalında hopdurulması, sonra onun vakuum altında inert mühitdə qurudulması, daha sonra isə nümunənin yüksək temperaturda parçalanmasıdır (Semikolenova, 2002, p. 752).

İşin müəllifləri keçid element tərkibli amino piridil üzvi liqandlı komplekslərdən istifadə etməklə, daha aktiv katalitik sistemlərin alınması üçün, Lyuis turşuları ilə modifikasiya edilmiş oksid daşıyıcı səthlərinə həmin komplekslərin çökdürülməsi yolu ilə əldə etmişlər (Semikolenova, 2005, p. 77).

Patentinin müəllifləri isə $LMCl_2$ metalkomplekslərini silikagel və ya təbii seolit səthinə çökdürməzdən əvvəl onun səthi alüminium üzvi birləşmələri (AÜB) $AlR_3$ (burada R = Et, t – Bu) ilə müvafiq olaraq 1:3 mol nisbətində $AlR_3/SiO_2$ birləşməsi alınana qədər işlənir. Bundan sonra hopdurma məhsulu əvvəlcə hava mühitində 400-700$^0$C, sonra isə vakuum altında və inert qaz mühitində 400-800$^0$C temperatur intervalında qızdırılması həyata keçirilir.

Bu istiqamətdə aparılan tədqiqatın əsas məqsədi üzvi həlledicidən, onda həll edilmiş lantanid tərkibli bəzi keçid metallarının metalkomplekslərinin $[(OC)_5M]_3Ln$ (burada M – keçid metalı Mn, Re; Ln – lantanid metalı Gd, Lu) təbii seolit səthinə çökdürülməsidir. Bunun üçün əvvəlcə təbii soelit – Xanlar betoniti susuzlaşdırılmış və onun səthinə müvafiq kompleks adsorbsiya yolu ilə hopdurularaq çökdürülmüşdür. Alınmış $[(OC)_5M]_3Ln$/NaX seolit tərkibli birləşmə 80-100$^0$C, sonra isə 200-350$^0$C kimi qızdırılır ki, bu da kompleksin tam dekarbonilləşməsini (-CO) və müvafiq intermetallik və seolit tərkibli $M_3Ln$/NaX təbii seolit tərkibli daha aktiv mərkəzli katalitik sitemin yaranmasını təmin edir (Zaxarov, 2007).

Bu tədqiqatda əsas məqsəd aşağıdakı çatışmazlıqların aradan qaldırılmasından ibarət olmuşdur.

1. Bir qayda olaraq, müxtəlif tərkibli komplekslərin daşıyıcı səthinə adsorbsiyasını həyata keçirilməsindən əvvəl onun səthi alüminium üzvi birləşmələrdən (AÜB) istfadə etməklə hopdurulması prosesinin həyata keçirilməsi.
2. Daşıyıcı səthinə hopdurulmuş AÜB-nin iki mərhələli 400-800$^0$C temperatur intervalında vakuum və inert qaz mühitində termiki parçalanmasının təmin edilməsinin həyata keçirilməsi.
3. AÜB-nin sintezi və ondan istifadə zamanı yüksək yanğın təhlükəsinin olması.
4. Metodun yalnız tək nüvəli metalkomplekslərə şamil edilməsi və bununla da onun istifadə imkanlarını xeyli aşağı salması (Mahmudov, 2023, s. 55-60).

Bu çatışmazlıqların aradan qaldırılması üçün daşıyıcı kimi üç pilləli, I – 20-180$^0$C, II – 180-450$^0$C, III – 450-550$^0$C intervalında termiki işlənməyə məruz qoyulmuş təbii seolit – Azərbaycan gilabisinin ($NaX \cdot SiO_2 \cdot Al_2O_3 \cdot Fe_2O_3 \cdot CdO \cdot MgO$) Xanlar bentonintinin dehidratasiya yolu ilə susuzlaşdırılmış formasından istifadə edilmişdir (Belechkaya, 1988, pp. 10-22).

Bu formalı seolitin səthinə, polyar və düz müstəvi formalı həlledici olan tetrahidrofuranda həll edilmiş $[(OC)_5M]_3Ln$ kompleksini adsorbsiya yolu ilə tam hopdurmaqla (çökdürməklə) alınmış $[(OC)_5M]_3Ln$/NaX-seolit birləşməsinin əvvəlcə həlledicinin desorbsiyası üçün 80-100$^0$C, sonra isə 1,2-3,3 saat müddətində, $M_3Ln$/NaX-seolit əsaslı yeni, daha aktiv katalitik sistem yaratmaq mümkün olmuşdur (Makhmudov, 1992).

Digər tərəfdən $[(OC)_5M]_3Ln$ kompleksinin dekarbonilləşməsindən alınan karbonmonoksid (CO) proses zamanı xüsusi qaz mühiti yaratmaqla onu daha da effektli edir. Belə ki, $[(OC)_5M]_3Ln$/NaX-seolit birləşməsinin termiki parçalanması zamanı prosesdə başqa inert qazdan istifadəyə ehtiyac qalmır (Belechkaya, 1989, p. 232).

Üzvi həlledicilərdə həll edilmiş lantanid tərkibli $[(OC)_5M]_3Ln$ metalkomplekslərinin NaX-seolit tip daşıyıcı səthinə hopdurularaq çökdürülməsi onunla izah edilir ki, bir tərəfdən dehidratasiyaya uğradılmış seolitin boş kristallik qəfəsinin aktiv mərkəzləri ilə qarşılıqlı təsiri nəticəsində, digər tərəfdən isə, birləşmədəki Ln-atomunun güclü oksofilliyi bu mərkəzlərlə eyni zamanda koordinasiya etmək meylini artırdığından, son nəticədə kompleksin həlledicidən adsorbsiya yolu ilə ayrılması baş verir ki, bu da sonda $[(OC)_5M]_3Ln$/NaX-seolit tərkibli birləşməsinin alınmasına səbəb olur (Agapashayeva, 1994, pp. 28-31). Bununla da alınmış birləşmənin əvvəlcə 80-100$^0$C temperatur intervalında vakuumsuz şəraitdə işlənməsi həlledicinin desolvatasiyasını, daha sonra onun 200-350$^0$C temperatur intervalında işlənməsi isə M-la donor-akseptor tip kimyəvi rabitə ilə birləşmiş CO qruplarının $[(OC)_5M]$ fraqmentindən dekarbonilləşməsi, Ln-M metal-metal kimyəvi rabitəsinin saxlanması, müvafiq lantanid tərkibli intermetallik $M_3Ln$/NaX-seolit yeni sistemin alınmasına gəti-rib çıxarır (Zakharov, 2007).

Cədvəl 1-də $[(OC)_5M]_3Ln$ komplekslərinin tetrahidrofuran həlledicisində həll olması üçün optimal şəraitini seçilməsi, cədvəl 2-də $[(OC)_5M]_3Ln$ kompleksinin susuzlaşdırılmış NaX-seolit səthinə çökdürülməsi üçün optimal şəratin seçilməsi, cədvəl 3-də seolit səthinə çökdürülmüş $[(OC)_5M]_3Ln$/NaX-seolit birləşməsinin termiki işlənməsi nəticəsində intermetallid tərkibli $M_3Ln$/NaX-seolit sisteminin alınması üçün optimal şəraitin seçilməsi nəticələri verilmişdir.

**Cədvəl 1**

Qadolinium (lütesium) tərkibli trismanqan (renium) pentakarbonil metalkomplekslərinin $[(OC)_5M]_3Ln \cdot THF_n$ bəzi üzvi həlledicilərdə həllolma qabiliyyətləri

| Həll ediləcək metalkompleksin tərkibi | Götürülən miqdar, mmol | Həlledici və onun miqdarı | | Temperatur, $^0$C | Maksimum həllolma, % |
|---|---|---|---|---|---|
| | | həlledici | ml | | |
| $[(OC)_5Mn]_3Gd\cdot(C_4H_8O)_3$ | 1<br>1<br>1 | THF<br>aseton<br>heksan | 25<br>25<br>25 | 40<br>40<br>40 | 34<br>29<br>11 |
| $[(OC)_5Re]_3Gd\cdot(C_4H_8O)_3$ | 1<br>1<br>1 | THF<br>aseton<br>heksan | 25<br>25<br>25 | 40<br>40<br>40 | 36<br>23<br>9 |
| $[(OC)_5Mn]_3Lu\cdot(C_4H_8O)_4$ | 1<br>1<br>1 | THF<br>aseton<br>heksan | 25<br>25<br>25 | 40<br>40<br>40 | 43<br>37<br>14 |
| $[(OC)_5Re]_3Lu\cdot(C_4H_8O)_4$ | 1<br>1<br>1 | THF<br>aseton<br>heksan | 25<br>25<br>25 | 40<br>40<br>40 | 45<br>24<br>12 |

**Cədvəl 2**

Qadolinium (lütesium) tərkibli trismanqan (renium) pentakarbonil metalkomplekslərinin $[(OC)_5M]_3Ln{\cdot}THF$ məhlulundan daşıyıcı səthinə çökdürülməsinin optimal şəraiti

| Daşıyıcı səthinə çökdürüləcək metal-kompleksin formulu | Miqdarı q | Həlledici və onun miqdarı | | Adsorbsiya zamanı həcmin azalması ml | Daşıyıcı susuzlaşdırılmış NaX təbii seolitin miqdarı, q | Daşıyıcı ilə metal-kompleksin kontakt müddəti, saat | Kontakt temperaturu, $^0C$ | Son çökdürmə məhsulu | $[(OC)_5M]_3$ Ln-ə görə çıxım | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | $C_4H_8O$ | ml | | | | | | % | q |
| $[(OC)_5Mn]_3Gd{\cdot}(C_4H_8O)_3$ | 0.37 | THF | 25 | 5.2 | 5 | 1 | 25 | $[(OC)_5Mn]_3Gd/NaX{\cdot}$seolit $(THF)_4$ | 100 | 9.78 |
| $[(OC)_5Re]_3Gd{\cdot}(C_4H_8O)_3$ | 0.44 | THF | 25 | 4.8 | 5 | 1.2 | 25 | $[(OC)_5Re]_3Gd/NaX{\cdot}$seolit $(THF)_4$ | 100 | 8.34 |
| $[(OC)_5Mn]_3Lu{\cdot}(C_4H_8O)_4$ | 0.52 | THF | 25 | 5.1 | 5 | 1.2 | 30 | $[(OC)_5Mn]_3Lu/NaX{\cdot}$seolit $(THF)_4$ | 100 | 9.02 |
| $[(OC)_5Re]_3Lu{\cdot}(C_4H_8O)_4$ | 0.56 | THF | 25 | 4.8 | 5 | 1.2 | 30 | $[(OC)_5Re]_3Lu/NaX{\cdot}$seolit $(THF)_4$ | 100 | 8.65 |

**Cədvəl 3**

Qadolinium (lütesium) tərkibli trismanqan(renium) pentakarbonil metalkomplekslərinin NaX seolit səthinə çökdürmə məhsullarının $[(OC)_5M]_3Ln$/NaX seolit $(THF)_4$ termiki işlənməsi yolu ilə intermetallid tərkibli $M_3Ln$/NaX seolit katalitik sistemlərin alınması üçün optimal şərait

| Çökdürmə məhsulları | Miqdarı, q | Qızdırılma temperaturu, $^0C$ | Nümunənin termiki işlənmə müddəti, saat | Desolvatasiya və qızdırılma məhsulları | İntermetallidin seolitdəki kütlə payı, % |
|---|---|---|---|---|---|
| $[(OC)_5Mn]_3Gd$/NaX seolit $\cdot(THF)_4$ | 5.58 | 20–350 | 2 | $Mn_3$ Gd/NaX· seolit+THF+nCO | 1.18 |
| $[(OC)_5Re]_3Gd$/NaX seolit $(THF)_4$ | 5.78 | 20–350 | 1.45 | $Re_3$ Gd/NaX· seolit+THF+nCO | 1.22 |
| $[(OC)_5Mn]_3Lu$/NaX seolit $(THF)_4$ | 5.28 | 220–350 | 2.2 | $Mn_3$ Lu/NaX· seolit+THF+nCO | 1.64 |
| $[(OC)_5Re]_3Lu$/NaX seolit $(THF)_4$ | 5.87 | 20–350 | 2.6 | $Re_3$ Lu/NaX· seolit+THF+nCO | 1.72 |

Qadoliniumun trispentakarbonilmanqan $[(OC)_5Mn]_3Gd$ metal kompleksinin THF məhlulunun hazırlanması və onun daşıyıcı səthinə çökdürülməsi aşağıdakı qaydada aparılmışdır.

Reaksiya qarışığından solvat şəklində $[(OC)_5Mn]_3Gd \cdot (C_4H_8O)_3$ ayrılmış 0,82 q kompleks istənilən miqdar THF həlledicisində həll edilə bilər. Məsələn, 25 ml THF-da həll olması nəticəsində kompleksin götürülmüş həcmdəki qatılığı hesablanarkən kompleksə solvat şəklində birləşmiş THF

molekullarının çəkisi nəzərə alınır. Odur ki kompleksin qatılığı 0,82 çəkiyə deyil, 0,604-ə görə hesablanmalıdır.

*Qadolinium trispentakarbonil manqan $[(OC)_5Mn]_3Gd$ kompleksinin THF həlledicisindən seolit səthinə çökdürülməsi.*

Bunun üçün yuxarıdakı nümunələrə uyğun olaraq, 0,37 q $[(OC)_5Mn]_3Gd$ kompleksinin 25 ml tetrahidrofuran həlledicisindəki nümunəsi $25^0C$ temperaturda 5 q susuzlaşdırılmış seolit əlavə edilərək, vaxtaşırı qarışdırılmaqla 1 saat müddətində saxlanılır və seolit sonra da dekantasiya etmək yolu ilə məhluldan ayrılır. Bu zaman həlledicinin həcminin 5,2 ml azaldığı müşahidə olunur.

İQ-spektrin nəticələrinə görə qalıq məhlul $\nu_{CO}$-nun 1700-2100 $sm^{-1}$ heç bir udulma zolağına malik olduğu qeyd edilməmişdir. Bu fakt isə, öz növbəsində, kompleksin seolit tərəfindən adsorbsiya yolu ilə səthinə tam çökdürülməsini təsdiq edir. Nəticədə, 9,78 q $[(OC)_5Mn]_3Gd$/NaX-seolit $(THF)_n$ formuluna uyğun çökdürülmə məhsulu alınır. Birləşmənin vazelin yağındakı İQ-spektri $[(OC)_5Mn]$ fraqmentinə uyğun CO-qruplarının $\nu_{CO}$-nun 1700-2100 $sm^{-1}$ intervalında mövcudluğu və 840, 1085 $sm^{-1}$ ($\nu_{C-O_{THF}}$) valent tezliklərinə uğun zolaqların olduğu müşahidə edilmişdir ki, bununla da alınan birləşmədə THF molekullarının da olduğu təsdiq edilir. Birləşmənin 80-$100^0C$ temperatur intervalında 0,5 saat müddətində qızdırılması nəticəsində ayrılmış THF-nın miqdarına görə onun n = 4 olduğu müəyyən edilmişdir.

*$[(OC)_5Mn]_3Gd$/NaX-seolit·4THF çökdürmə məhsulunun termiki işlənməsi yolu ilə intermetallid tərkibli $M_3Gd$/NaX-seolit katalitik sisteminin yaradılması.*

Bunun üçün alınmış 5,58 q $[(OC)_5Mn]_3Gd$/NaX-seolit·4THF birləşməsi iki mərhələli termiki işlənməyə məruz qoyulmuşdur.

Nümunənin birinci termiki işlənmə mərhələsində 20 ÷ $200^0C$-yə qızdırılması aparılır ki, bu zaman soelit və lantanid atomu ilə koordinasion rabitədə olan THF-molekullarının desolvatasiyası təmir edilir.

Termiki işlənmənin ikinci pilləsində nümunə 200-$350^0C$ temperatur intervalında 2 saat müddətində birləşmədəki $[(OC)_5Mn]_3Gd$ kompleksinin dekarbonilləşməsi həyata keçirilir.

Bu yolla termiki işlənməyə məruz qoyulmuş nümunə İQ-spektrin nəticələrinə görə terminal CO-qruplarının $\nu_{CO}$-nun 1700-2100 $sm^{-1}$ texliklərində heç bir udulma zolaqlarının olmaması, kompleksin tam dekarbonilləşməyə uğradığını sübut edir. Nəticədə, 5,27 q 100% çıxımla qadolinium üç manqan intermetallid tərkibli $Mn_3Gd$/NaX-seolit katalitik sistemi yaradılmışdır.

Element analizin nəticələrinə görə $Mn_3Gd$ intermetallidinin seolitdəki kütlə payı 1,18% təşkil edir.

*Lütesium trispentakarbonilmanqan $[(OC)_5Mn]_3Lu$ kompleksinin THF həlledicisindən seolit səthinə çökdürülməsi.*

Bunun üçün yuxarıdakı metodikaya uyğun olaraq 0,52 q $[(OC)_5Mn]_3Ln$ kompleksi 25 ml THF həlledicisində, 5 q susuzlaşdırılmış seolit əlavə edilərək vaxtaşırı 1, 2 saat müddətində $25^0C$ temperaturda qarışdırılır.

Adsorbsiya zamanı həlledicinin həcminin 5,1 ml azaldığı müşahidə olunur. Nəticədə, 9,02 q çökdürmə məhsulu $[(OC)_5Mn]_3Lu$/NaX-seolit·4THF tərkibli birləşmə əldə edilir. Nümunənin 80-$100^0C$ temperaturda qızdırılması THF-nın birləşmədən tam çıxmasını təmin edir.

*$[(OC)_5Mn]_3Lu$/NaX-seolit·4THF çökdürmə məhsulunun termiki işlənməsi yolu ilə intermetallid tərkibli $Mn_3Lu$/NaX-seolit katalitik sistemin yaradılması.*

Bunun üçün yuxarıdakı metodikaya uyğun olaraq alınmış 5,71 q $[(OC)_5Mn]_3Lu$/NaX-seolit birləşməsi məlum metodikaya uyğun termiki 2,2 saat müddətində işlənməyə məruz qoyulur.

Nəticədə, 5,28 q – 100 % çıxımla lütesium üç manqan intermetallid tərkibli $Mn_3Lu$/NaX-seolit katalitik sistemi yaradılmışdır. İQ-spekr nümunənin tam dekarbonilləşməsini təsdiq edir.

Element analizi nəticələrinə görə $Mn_3Lu$ intermetallidinin seolitdəki kütlə payı 1,64 % təşkil edir.

*Qadolinium trispentakarbonilrenium $[(OC)_5Re]_3Gd$ kompleksinin THF həlledicisindən seolit səthinə çökdürülməsi.*

Topoloji fəzaların və kəsilməz inikasların topoloji ekvivalentlik dəqiqliyinədək təsnif etmək problemini hesabi, cəbri funktorları bilavasitə istifadəsilə görünür, həll etmək mümkün deyil. Hesablanan funktorlara əsasən öz hesabililiyi səbəbindən kəsilməz deformasiyalara nəzərən invariantdır (Aleksandrov & Pasynkov, 1973).

Beləliklə, bu funksiyalar fəzaları (və inikasları) [hansıları ki, kəsilməz olaraq bir birinə deformə etmək mümkündür] ayırmır (fərqləndirmir). Kəsilməz deformasiya dəqiqliyi ilə bu funktorların fəza və intikasları xarakterizə etdiyini diqqətə almaq olar.

Kəsilməz deformasiyalar haqqında intuktiv təsəvvürü homotopiya anlayışı ilə dəqiqləşdirmək olar. Bu isə cəbri topologiyada vacib mənası olan homotopik tip kateqoriyaya gətirir. Onun obyektləri topoloji fəzalardır, morfizmləri isə kəsilməz inikasların ekvivalentlik sinifləridir (iki inikas o halda ekvivalent sayılır ki, əgər onları bir-birinə deformə etmək mümkündürsə).

Poliedr dedikdə simplisial kompleksin frianqulyasiyasına imkan verən topoloji fəza başa düşülür. Simplisial kompleks – təpə nöqtələri və simplekslərin (hər bir simpleks sonlu təpələr çoxluğu) mücərrəd sxemidir. Simplisial kompleks və poliedrlərin öyrənilməsini çox zaman kombinator topologiya adlandırırlar. Simplisial kompleks $(K)$ təpələr çoxluğu $\{\upsilon\}$, $\{\upsilon\}-nin$ boş olmayan sonlu $\{S\}-$simplekslər çoxluğundan ibarətdir, belə ki,

$(a)-$bir təpə, nöqtədən ibarət istənilən çoxluq simpleksidir;

$(b)-$simpleksin istənilən boş olmayan alt çoxluğu simpleksidir;

$(q+1)-$ə bərabər təpə nöqtələrinə malik $S-$simpleksi $q-$ölçülü simpleks adlanır, $\dim S = q$ yazılır. $K-$simplisial kompleks isə $\dim K$ bərabərdir.

$(a)$ -1 , əgər $K-$boşdursa

$(b)$ n, əgər $K-$heç olmasa bir ölçülü simpleksə malikdirsə və $(n+1)$- ölçülü simpleksi yoxdursa.

$(c)\infty$, əgər $\forall \Pi \geq 0$ üçün $K-$ya aid $\Pi-$ölçülü simpleks malikdirsə.

Topoloji fəzaları və kəsilməz inikasları topoloji ekvivalentlik dəqiqliyi ilə təyin etmək üzrə topoloji fəzaların təsnifatı problemini, görünür ki, bilavasitə istifadə olunan cəbri funktorlara görə həll etmək mümkün deyil. Hesablanan funktorlar, əsasən kəsilməz deformasiyalara nəzərən olduğundan, bu funktorlar fəzanı və inikası kəsilməz deformasiya dəqiqliyi ilə xarakterizə edir (Borisovich & Bliznyakov, 1980).

$X^{|}$ nəzərən homotopiya $(X,A)$ cütünün $(Y,B)$ cütünə inikasları çoxluğunda ekvivalentlik münasibətidir.

Homotop inikasların kompoziyası da homotopdur.

Boş olmayan ən sadə fəza bir nöqtədən ibarətdir. Belə fəzanın homotopik tipini belə xarakterizə etmək olar. Topoloji $X$ fəzası sıxlaşdırılmış adlanır o halda ki, əgər $X$ fəzasının eynilik inikası $X$ fəzasının hər hansı sabit inikasına homotopdur.

Əgər $X^{|} \subset X$ və iki $f_o, f_|$ inikasları $f_o, f_|:(X,A) \to (YB)$ $X^{|}-$də üst-üstə düşür (yəni, $f_0|X^{|} = f_||X^{|}$)/ Bu halda $f_0-$inikası $X$ nəzərən $f_|-$inikası homotop adlanır ($f_0 \approx f_| \, re\ell X^{|}$ işarə olunur) Əgər $F:(X,A)XI \to (Y,B)$ inikası varsa ki, $F(x,0)=f_0(x)$, $F(x,1)=f_|(x)$, $x \in X$ və $F(x,t)=f_0(x)$, $x \in X$ və $t \in \mathrm{I}$ olsun.

Digər oblastların (sahələrin) bilavasitə təsiri altında formalaşan topoloji obyektlər çox zaman aşağıdakı vacib xüsusiyyətlərə malik olur: onların topologiyası hər hansı digər daha kəskin (ciddi) riyazi-struktura ilə doğrulur (yaranır) ki, o baxılan obyektin təbiəti ilə əlaqədədir. Bununla bağlı fundamental xarakterli aşağıdakı qarşılıqlı əlaqəli suallar yaranır.

1) Baxılan "xarici" strukturun (kombinator, diferensial, cəbri və başqaları) invariantları topologiyanın bu strukturlarıyla doğrulan (törəyən, yaranan) invariantlarla necə əlaqədədir?

2) Verilmiş "xarici" strukturun hansı invariantları onunla doğrulan topologiyanın invariantları (yəni topoloji invariantlarıdır)?

3) Baxılan topologiyanın doğuran, izomorfizm dəqiqliyinədək verilmiş tipdə müxtəlif "xarici" strukturlar mövcuddur. Hər şeydən əvvəl aydınlaşdırmaq vacibdir ki, heç olmazsa belə bir struktur varmı, xüsusi əhəmiyyət kəsb edir ki, belə struktur yeganədir (izomorfizm dəqiqliyinədək) – onda o (və nəticə etibarilə onun bütün xarakteristikaları) baxılan topologiyanın invariant invariantlarıdır (topoloji)?

Kateqoriya – intuitiv olaraq çoxluqların məcmuyu (tamamlayıcı struktur olması mümkündür) və inikas (bu tamamlayıcı strukturu saxlayan), daha dəqiq ibarətdir (Gurevich & Vol'men, 1948):

– (a) hər hansı obyektlər sinfi

– (b) $\hom(X,Y)$– morfizmlərdən [X-təyin oblastı] $f: X \to Y$

– (c) funksiyalardan $(X,Y,Z)$ obyektlər üçlüyü üçün və $f: X \to Y$, və $g: Y \to Z$ onların kompozisiyası.

Qeyd olunmuş nöqtəli çoxluqlar kateqoriyası (qeyd olunmuş elementli çoxluq).

Əgər $X \in Set$ və $\alpha = \{A_i\}_{i \in I}$ indekslər çoxluğu olduqda $X \subset U\alpha$ olarsa, $\alpha$ ailəsi $X$ çoxluğunun örtüyü adlanır. $I$ sonlu (hesabi) olarsa, $\alpha$ sonlu (hesabi) örtük adlanır. $X$ çoxluğunun örtüklər çoxluğu -$Co\upsilon(X)$ [sonlu örtüklər çoxluğu - $Co\upsilon_0(X)$].

Əgər homomorfizm inyektiv, suryektiv və ya biyektiv inikas olarsa, onda uyğun olaraq o, monomorfizm, epimorfizm, yaxud izomorfizmdir.

Parakompakt fəza – elə topoloji fəzadır ki, onun istənilən açıq örtüyü daxilinə lokal sonlu örtük çəkmək mümkün olsun.

Kateqoriya heç də çoxluq və inikasların bəzi xassələrinin bəsit ümumiləşməsidir – doğru deyil.

Qruppoid elə kiçik kateqoriyaya deyilir ki, onun hər bir morfizmi ekvivalentdir.

Topologiyanın cəbri təcəssümü – bu topologiyanın cəbrə hansısa inikasıdır. Bu təsəvvür topoloji məsələni, ona uyğun cəbri məsələyə çevirmək imkanı yaradır, əgər bu tip çox sayda təcəssüm olarsa, onda topoloji məsələ o halda (və yalnız o halda) həll olunandır ki, bütün uyğun cəbri məsələlər həll edilən olsun. Belə bir inikas (təcəssüm) funktor adlanır; funktorlar isə kateqoriyaların inikasıdır (Lefshets, 1949).

İntuitiv olaraq kateqoriyanı çoxluqların (mümkün ki, əlavə struktura malik) və inikasların məcmuyu olaraq qəbul etmək olar. Daha dəqiq, kateqoriya ibarətdir:

(a) – hər hansı obyektlər sinfindən

(b) – hom $(X,Y)$– morfizmlər çoxluğundan: təyin oblastı $X$, qiymətlər oblastı $Y$ olmaqla $X,Y$ nizamlı obyektləri üçün [ əgər $f \in \hom(X,Y) is\ f: X \to Y$ yaxud $X \xrightarrow{f} Y$]

(c) Funksiyalardan; nizamlanmış $X,Y$ və $Z$ obyektlər üçlüyünə və $f: X \to Y, g: Y \to Z$ morfizmlər cütlüyünə uyğun $gf = g \circ f: X \to Z$ onların kompozisiyasından.

Belə F inikasına $X^{|}$ nəzərən $f_o$ və $f_|$ inikasları arasında homotopiyadır.

[ $F: f_o \approx f_| \ rel\ X^{|}$ işarə olunur].

Əgər $X^{|}$ = Ø olarsa? " Ø-a nəzərən" sözü buraxılır. $X$ fəzasının $Y$ fəzasına inikası sıfra homotopdur (yaxud cüzidir), o halda adlanır ki, əgər o, hər hansı sabit inikasa homotopdursa.

$(X,A)$ və $(Y,B)$ cütlüyü eyni homotopik tipdir deyilirsə, onlar cütlüyün homotopik tip kateqoriyasında ekvivalentdir.

İstənilən fəzanın hər hansı iki inikası "sıxlaşdırılmış" fəzaya homotopdur.

Birölçülü simplisal kompleks qraf adlanır. Birölçülü qraf ağac adlanır. Qraf o halda və yalnız o halda ağacdır ki, o dartılandır. Simplisal kompleks dartılan adlanır o halda ki, əgər onun fəzası dartılandırsa (Gasymov, Abdullayev, 2003).

Qruppoid – dedikdə elə kiçik kateqoriya başa düşülür ki, onun hər bir morfizmi ekvivalentlikdir. Kateqoriyaların ümumi xassələrindən gələn qruppoidlər haqqında bəzi xassələrin varlığını qeyd etmək olar.

Tutaq ki, $T^n$ (həndəsi, yaxud mücərrəd) $n-$ölçülü simpleks verilmişdir: onun müəyyən $\ell_0, \ell_1, \ldots \ell_n$ hər hansı qaydada təpələri $\ell_0, \ell_1, \ldots \ell_n$ nizamlanmlş reperə (bazisə) malik $T_n-$ sumpleksi alınır.

$T_n$ - sumpleksinin iki $\ell_0, \ell_1, \ldots \ell_n$ və $\ell_{i0}, \ell_{i1}, \ldots \ell_{in}$ bazisi (reperi o halda ekvivalent adlanır ki, birindən digərinə keçid cüt yerdəyişmə ilə icra olunur.

$$\begin{cases} \upsilon_1 = C_{11}U_1 + C_{12}U_{12} + --+C_{1n}U_n \\ \upsilon_2 = C_{21}U_1 + C_{22}U_2 + --C_{2n}U_n \\ ---------------- \\ \upsilon_n = C_{n1}U_1 + C_{n2}U_2 + --C_{nn}U_m \end{cases}$$

keçid düsturları.

$\mathrm{I}\langle U_1, U_2..U_n\rangle$ bazisindən $\mathrm{II} = \langle V_1, V_2..V_n\rangle$ bazisinə keçid q-məxsusi olduqda (determinantı müsbət) $\mathrm{I}$ və $\mathrm{II}$ - bazisləri ekvivalent (yaxud eyniadlı), digər halda əks oriyentasiyalı adlanır. $T_n$ simpleksinin oriyentasiyası $t^n$ müsbət isə, əks oriyentasiya -$t^n$ işarə olunur.

$\left|t^n\right| = \left|-t^n\right| = \left|\ell_0 \ldots \ell_n\right|$ və $-\ell = (\ell_{i0,\ell i1}, \ldots \ell \mathrm{in})$ simpleks $T$ isə $\left|t^n\right| = \left|-t^n\right| = \left|\ell_0, \ldots \ell_{\mathrm{n}}\right|$ işarə olunur.

Əgər $\mathrm{I}$ reperi kəsilməz deformasiya vasitəsilə $\mathrm{II}$ reperinə keçirsə, onda hər iki reper $R^n-$ fəzasının eyni oriyentasiyasına aiddir (Kuratovskiy, 1969).

İnsident əmsalları. Tutaq ki, $t^n-$oriyentasiyalı simpleks, $t^{n-1}-$isə onun necəsə oriyentasiyalanmlş $(n-1)$ölçülü üzüdür. $t^n-$simpleksi yeganə $\ell$ təpəsinə malikdir ki, $\left|t^{n-1}\right|$ üzünün təpəsi deyildir (bu üzə əks olan təpə).

$X(t) = (1-t)\cdot a + bt$, $t \in \mathrm{I}$ ilə təyin olunan $X : \mathrm{I} \to [a,b]$ homeomorfizmdir və $X(0) = a$, $X(1) = b$. Hər bir $f : [a,b] \to X$ yoluna $\bar{f} = f \cdot X : \mathrm{I} \to X$ yolunu qarşı qoymaq olar, və bu zaman $f$ və $\bar{f}$ yollarının başlanğıc və sonları uyğun olaraq üst-üstə düşəcək: $orij(f) = orij(\bar{f})$ və $end(f) = end(\bar{f})$.

Hər $f \in C([a,b], X)$ yoluna $\bar{f} \in C(\mathrm{I}, X)$ yolunu qarşı qoyan $f \to \bar{f}$ inikasını $X$ ilə işarə edək: $X : C([a,b], X) \to C(\mathrm{I}, X)$




**Şəkil 1**

Homotopiyanın əsas məsələsi verilmiş iki $\varphi$ və $\psi$ inikaslarının homotop olub-olmamasını təyin etməkdir.

Məsələ 1. $X$ fızasının ən sadə inikaslarını götürək: eynilik —— $id_x : X \to X$ və

sabit —— $const_a : X \to X$ (burada, (a) $X$ fəzasının hər hansı nöqtəsidir).

Əgər $H : id_x \sim const_a$ homotopiyası varsa, $X$ -ə dartılan fəza, $H : id_x \sim const_a$ homotopiyasına isə fəzanın nöqtəyə dartılması deyilir. Əgər $X$ fəzasının hər hansı dartılması varsa, $X$ fəzası nöqtəyə dartılan fəzadır.

$f : X \to A \qquad (f : g) : X \to AXA$

$d : X \to A \qquad (f : g)(x) = (f(x), g(x))$, $x \in X$

$(X,\tau)$ və $(Y,\xi)$ topoloji fəzalar, $X$ üzərində $X x \mathrm{I}$ silindrindən $(Y,\xi)$-ə təsir edən hər bir $H : X x \mathrm{I} \to Y$ kəsilməz inikası $(X,\tau)$-dən $(Y,\xi)$-ə homotopiyadır.

Səthlərin əlaqəli cəmini onların açılışı (tranqulyasiyası) üzərində müəyyən qaydada təyin edildiyi nümunəlri maraq kəsb edə bilər (Leng, 1968):

Səthlərin açılması və tranqulyasiyası arasında oxşar cəhətlər çoxdur. Məsələn, əgər kubu, sferanı və ya toru açdıqda müstəvi üzərində çoxbucaqlı və ya əyrixətli çoxbucaqlı alınar. Simpleks (sadə)$\to \to n = 3$ (tetraedr), $\mathrm{n} = 2$ (üçbucaq) (sadə, qabarıq çoxüzlü)

Tranqulyasiya zamanı isə təkcə əyrixətli çoxbucaqlı deyil, həm də bu çoxbucaqlının müəyyən qaydalara tabe olan üçbucaqlarla örtüyü alınır. $\alpha$ örtüyünə $M$ səthinin tranqulyasiyası deyilir. Deyilənləri proyektiv müstəvinin tranqulyasiyasnda nümayiş etdirmək olar.

Eyni rəqəmlərlə eyniləşmiş, yəni eyni bir təpə nöqtəsinin müxtəlif nüsxələri göstərilmişdir. Beləliklə, şəkildən göründüyü kimi, altı təpə nöqtəsi (1,2,3,4,5,6) və on üçbucaq meydana çıxır:

(1-2-4; 1-4-6; 1-6-3; 1-3-5; 1-5-2; 2-5-6; 3-6-2; 3-2-4; 3-4-5; 4-5-6)




**Şəkil 2**

## Nəticə

Topoloji fəzaların və kəsilməz inikasların təsnifatını topoloji ekvivalentlik dəqiqliyinə qədər vermək mümkün olmazdı, əgər cəbri funktorların hesablanması bilavasitə istifadə edilməsəydi.

Burada, göründüyü kimi, sorulması faydalı ola bilər ki, topoloji təsnifat sualının qoyulması nə dərəcədə özünü doğruldur. Çox ümumi təbiətli topoloji fəzalar üçün topoloji təsnifat, sadəcə, məna məhdudluğu doğurur; amma bu məsələnin qoyuluşu möhtəşəm məna kəsb edir; belə ki, nəticədə məlum olur ki, bu istiqamətdə hansı problemlər əhəmiyyət daşıyır. Cəbri funktorların hesabatlığı onların daha "kobud" məsələlərinin həllinə tətbiqi nəticəsidir; məhz buna görə bu məsələni həll etmək lazımdır.

Ekvivalentliyin daha zəif münasibəti, hansı ki, kəsilməz deformasiyanı əsas götürür, təsnifatın digər məsələsinə gətirir. Bu axırıncı məsələ xüsusilə cəbri topologiyada vacibdir, ona görə ki, məhz burada onun metodları daha effektlidir.

Kateqoriyaları öyrənərkən, başlıca olaraq, bir kateqoriyanın digərinə inikası diqqət çəkir. Cəbri topologiyada vahidi və kompozisiyanı saxlama xassələrinə malik inikaslar – funktorların tədqiqi önəm kəsb edir.

Topoloji fəzaları və kəsilməz inikasları topoloji ekvivalentlik dəqiqliyi ilə təyin etmək üzrə topoloji fəzaların təsnifatı problemini, görünür ki, bilavasitə istifadə olunan cəbri funktorlara görə həll etmək mümkün deyil. Hesablanan funktorlar, əsasən, kəsilməz deformasiyalara nəzərən olduğundan, bu funktorlar fəzanı və inikası kəsilməz deformasiya dəqiqliyi ilə xarakterizə edir. Topoloji invariantların sistemi ilə bağlı topoloji fəzaların sinifləri yaranır. Daha vacib olan siniflərdən ölçülən (metrizə olunan) fəzalar, kompakt fəzalar, parakompakt fəzaları qeyd etmək

əsasdır. Araşdırılan xassələr, hər bir konkret topoloji fəza məsələsinin həllində əsas götürülməklə, öz təsdiqini tapmalıdır.

## Ədəbiyyat

1. Aleksandrov, P. S. (1985). *Vvedeniye v gomologichnuyu teoriyu razmernosti*. Nauka.
2. Aleksandrov, P. S., & Pasynkov, B. A. (1973). Vvedeniye v teoriyu razmernostey.
3. Borisovich, Yu. G., & Bliznyakov, N. M. (1980). *Vvedeniye v topologiyu*. Vyssheye obrazovaniye.
4. Burbaki, N. (1968). *Obshaya topologiya*. *Bazovyye struktury*.
5. Gasymov, V. A., & Abdullayev, F. A. (2003). *Ardıcıllıq cəbri*. BDU.
6. Gurevich, V., & Vol'men, G. (1948). *Teoriya razmernostey*. Moskva IL.
7. Kuratovskiy, K. (1969). *Topologiya*. Mir.
8. Kasymov, V. Ə. (2006). *Topologiya i nekotoryye yeye prilozheniya*.
9. Lefshets, S. (1949). *Algebraicheskaya topologiya*. STRANA.
10. Leng, S. (1968). *Algebra*. Mir.
11. Qasımov, V. A. (1998). *Cəbr və ədədlər nəzəriyyəsi*.
12. Spen'yer, E. (1989). *Algebraicheskaya topologiya*. Mir.

Daxil oldu: 01.10.2024
Baxışa göndərildi: 18.10.2024
Təsdiq edildi: 02.11.2024
Çap olundu: 20.11.2024

https://doi.org/10.36719/2663-4619/108/193-197

**Aygün Rəsulova**
Heydər Əliyev adına Hərbi İnstitut
hasanova.aygun11@gmail.com
**Nina Mustafayeva**
Heydər Əliyev adına Hərbi İnstitut
mustafayevanina@gmail.com

# Kvant çuxurunda elektron qazının hal sıxlığı

**Xülasə**

Ümumiyyətlə, aşağıölçülü sistemlərin fiziki xassələrinin tədqiq edilməsi müasir fizikanın aktual problemlərindəndir. Məlumdur ki, real aşağıölçülü sistemlərin profilləri sadə olmayıb, mürəkkəb kvant çuxuruna malikdirlər ki, onların termodinamik və kinetik xassələrini öyrənmək olduqca vacibdir.

Təqdim edilən bu işdə potensialı $U = U_0 ctg^2(\pi z/L)$ şəklində olan kvant çuxurunda elektronların enerji spektri üçün analitik ifadə alınmışdır. Xüsusi hallarda bu enerji spektri sonsuz dərin quyu və harmonik ossilyator modellərindəki enerji spektrlərinə keçir. Bunun üçün nazik təbəqələrdə kvant çuxurlarının profillərinin qurulması, enerji spektrinin, dalğa funksiyası və hal sıxlığı funksiyasının hesablanması, hal sıxlığı funksiyasının kvant çuxurunun potensialından asılılığının araşdırılması xüsusi maraq kəsb edir. Bu səbəbdən mürəkkəb formalı kvant çuxuruna malik təbəqələrdə fiziki hadisələrin nəzəri olaraq araşdırılması xüsusi maraq və əhəmiyyət kəsb edir. Belə tədqiqatlar isə öz növbəsində aşağıölçülü elektron sistemlərdə köçürmə hadisələrinin nəzəriyyəsində yeni sahələlərin inkişafına köməklik göstərir. Baxılan bu işdə əldə olunan nəticələr molekulyar-şüa epitaksiya metodunun köməyi ilə daha perspektivli kvant çuxurlarının yaranmasına imkan verir.

Tapılmışdır ki, baxılan spektr üçün elektronların hal sıxlığı funksiyası enerjinin pilləvari funksiyası olur.

***Açar sözlər:*** *kvant çuxuru, harmonik ossilyator, hal sıxlığı, enerji spektri, dalğa funksiyası*

**Aygun Rasulova**
Military Institute named after Heydar Aliyev
hasanova.aygun11@gmail.com
**Nina Mustafayeva**
Military Institute named after Heydar Aliyev
mustafayevanina@gmail.com

# Density of States of Electron Gas in Quantum Wells

**Abstract**

In general, studying the physical properties of low-dimensional systems is one of the urgent problems of modern physics. It is known that the profiles of real low-dimensional systems are not simple, they have a complex quantum hole, so it is very important to study their thermodynamic and kinetic properties.

An analytical expression is obtained for the energy spectrum and the density of states of electrons in a quantum well with the potential $U = U_0 ctg^2(\pi z / L)$, which in limiting cases transforms into energy spectra and densities of states for models of an infinitely deep well and harmonic the oscillator. For this purpose, it is of particular interest to establish the profiles of quantum holes in thin films, calculate the energy spectrum, wave function and density of state function, and investigate the dependence of the density of state function on the potential of the quantum hole. For this reason, the theoretical investigation of physical phenomena in layers with

quantum wells of complex shape is of special interest and importance. Such studies, in turn, contribute to the development of new fields in the theory of transfer phenomena in low-dimensional electronic systems. The results obtained in the reviewed work allow the creation of more promising quantum holes with the help of the molecular-beam epitaxy method.

The dependence of the density of states on energy for various semiconductor quantum wells is constructed.

***Keywords:*** *quantum well, harmonic oscillator, density of states, energy spectrum, wave function*

## Giriş

Hal sıxlığı funksiyasının yükdaşıyıcıların enerji spektrindən asılılığı termodinamik xassələrdə, optik, maqnit xassələrdə, həmçinin kinetika hadisələrində əks olunur (Əsgərov, Fiqarova və Xasıyeva, 2015). Xüsusilə aşağıölçülü elektron sistemlərinin fiziki xassələrində hal sıxlığı funksiyası çox əhəmiyyətli rol oynayır (Əsgərov, 2012). Bu sistemlərdə yükdaşıyıcıların hərəkəti bir, iki, yaxud hər üç istiqamətdə kvant məhdudlanmasına məruz olduqda, yükdaşıyıcının enerji spektri və buna görə də hal sıxlığı keyfiyyətcə dəyişir. Belə ki, elə fiziki kəmiyyətlər var ki, onlar hal sıxlığı funksiyası ilə təyin olunurlar. Bu kəmiyyətlərə misal olaraq entropiya, istilik tutumu, maqnit qavrayıcılığı, kvantlayıcı maqnit sahəsində termoelektrik hərəkət qüvvəsini göstərmək olar.

**Tədqiqat**

Hal-hazırda nanotenologiyanın səviyyəsi düzbucaqlı, parabolik, üçbucaq şəkilli və s. kimi müxtəlif növlərinə uyğun kvant çuxurlarının yaratmasına imkan verir (Mircea, 2017).

Təqdim olunan işdə potensialı $U = U_0 ctg^2(\pi z/L)$ profilli kvant quyusunun hal sıxlığı nəzəri tədqiq edilmişdir. Belə potensiallı kvant çuxurlarında enerji spektri xüsusi hallarda sonsuz dərin düzbucaqlı potensial çuxurun və harmonik ossilyatorun enerji spektrləri ilə üst-üstə düşür. Potensialı $U = U_0 ctg^2(\pi z/L)$ şəklində olan kvant çuxurunun enerji spektri üçün elektronların hal sıxlığı funksiyası tapılmış və elektron qazının enerjisindən asılılığı müəyyən edilmişdir. Bundan başqa göstərilmişdir ki, hal sıxlığı funksiyası limit hallarında ölçüyə görə kvantlanmış təbəqənin və parabolik çuxurun hal sıxlığı funksiyaları ilə üst-üstə düşür (Figarova, Khasiyeva, & Mahmudov, 2014; Lykova, 2008).

**Enerji spektri**

Enerji spektri

$$\varepsilon_{n,k_x,k_y} = \frac{\hbar^2 k_\perp^2}{2m} + \varepsilon_n \qquad (1)$$

ifadəsi ilə təyin olunan ikiölçülü elektron qazına baxaq. Burada $k_\perp^2 = k_x^2 + k_y^2$ və x,y oxu boyunca enerji spektri kəsilməz, *z* oxu boyunca isə diskret qiymətlər alır (Askerov, 1985).

Potensialı $U = U_0 ctg^2(\pi z/L)$ şəklində olan kvant çuxurunda $\varepsilon_n$ enerji spektrini tapaq. Şəkil 1-də $U$ funksiyasının z-dən asılılığı göstərilmişdir (Madkour, 2019).




**Şəkil 1** U funksiyasının z-dən asılılığı

$U = U_0 ctg^2(\pi z/L)$ potensiallı kvant çuxurunda elektron üçün Şredinger tənliyi aşağıdakı şəkli alır (Babayev & Sultanova, 2009):

$$\frac{\partial^2\psi}{\partial z^2} + \frac{2m}{\hbar^2}\left[\varepsilon - U_0 ctg^2(\pi z/L)\right]\psi = 0 \qquad (2)$$

Bu tənlikdə $U_0$ potensialın minimum qiyməti, L-çuxurun enidir.

$$\frac{d^2u}{dz^2} - 4\frac{\pi}{L}\lambda ctg\frac{\pi z}{L}\frac{du}{dz} + \frac{4\pi^2}{L^2}(\nu^2 - \lambda^2)u = 0 \qquad (3)$$

Hipergeometrik tənliyi alarıq. Bu tənliyin həlli isə aşağıdakı kimidir:

$$\varepsilon_n = (n^2 + 4n\lambda - 2\lambda)\varepsilon_0 \quad \text{n=1, 2, 3,....} \qquad (4)$$

Burada: $\lambda = \frac{1}{4}\sqrt{1 + \frac{4U_0}{\varepsilon_0}} - 1$, $\varepsilon_0 = \frac{\hbar^2\pi^2}{2mL^2}$, $L$ çuxurun eni, $U_0$ çuxurun dərinliyidir.

Aldığımız (4) enerji spektrindən 2 xüsusi limit halı alınır (Chickering & Eisenstein, 2009).

Kvant ədədinin *(N)* çox böyük qiymətlərində, yəni $n >> \lambda$ olsa, (1) ifadəsi sonsuz dərin çuxurdakı elektron qazının enerji spektri ilə üst-üstə düşür, yəni

$$E_{nk\perp} = \frac{\hbar^2 k_\perp^2}{2m} + \frac{\hbar^2\pi^2 n^2}{2mL^2} \qquad (5)$$

Əks limit halında, yəni kiçik kvant ədədləri halında $(n << \lambda)$, (1) ifadəsi parabolik kvant çuxurundakı elektron qazının enerji spektri ilə üst-üstə düşür, yəni

$$E_{nk\perp} = \frac{\hbar^2 k_\perp^2}{2m} + \hbar\omega_0\left(n - \frac{1}{2}\right) \qquad (6)$$

**Hal sıxlığı**

Məlum olduğu kimi, elektron qazının hal sıxlığı, yəni vahid enerji intervalına və vahid səthə düşən halların sayı aşağıdakı ümumi ifadə ilə təyin olunur (Shchvartsburg, 2002; Hashimzade, Babayev, & Mehdiyev, 2010):

$$g(\varepsilon) = \sum_{n,k_x,k_y}\delta(\varepsilon - \varepsilon_{n,k_x,k_y}), \qquad (7)$$

burada $\varepsilon_{n,k_x,k_y}$ (1) enerji spektri ilə təyin olunur. $k_x, k_y$ - ə görə cəmləmədən inteqrala keçsək,

$$g(\varepsilon) = \frac{2L_xL_y}{(2\pi)^2}\sum_n\int dk_x dk_y\delta(\varepsilon - \varepsilon_z - \varepsilon_\perp) \qquad (8)$$

alarıq. Son ifadədə $dk_x dk_y$ - ə görə inteqrallamadan polyar koordinatlara, yəni $dk_x dk_y = k_\perp dk_\perp d\varphi$ keçib, (8)-də nəzərə alsaq,

$$g(\varepsilon) = \frac{m}{\pi\hbar^2 L}\sum_n\int d\varepsilon_\perp\delta(\varepsilon - \varepsilon_z - \varepsilon_\perp), \qquad (9)$$

olar.

Burada $\varepsilon_\perp = \frac{\hbar^2 k_\perp^2}{2m}$.

## Nəticə

Bunları nəzərə alsaq, verilmiş enerji spektri üçün uyğun hesablamalardan sonra hal sıxlığı funksiyası aşağıdakı şəklə düşər:

$$g(\varepsilon) = \frac{m}{\pi\hbar^2 L}\sum_n \Theta(\varepsilon - \varepsilon_n). \qquad (10)$$

Bu düstur alınarkən

$$\sum_n \int d\varepsilon_\perp \delta(\varepsilon - \varepsilon_z - \varepsilon_\perp) = \sum_n \Theta(\varepsilon - \varepsilon_n), \qquad (11)$$

olduğu nəzərə alınmışdır (Figarova, 2014), burada $\Theta(\varepsilon - \varepsilon_n)$ – pilləvari Hevisayd funksiyasıdır.




**Şəkil 2** $U = U_0 ctg^2(\pi z/L)$ potensiallı kvant çuxurunun müxtəlif yarımkeçiricilər üçün hal sıxlığı funksiyasının $g(\varepsilon)$ asılılığı

Burada, hər 3 yarımkeçirici əsaslı quyu üçün $L = 10nm$ və $m = 0{,}2m_0$ (GaN), $m = 0{,}06m_0$ (GaAs), $m = 0{,}04m_0$ (CdTe) qiymətləri götürülmüşdür. Göründüyü kimi, funksiyanın qrafiki pilləvari xarakter daşıyır. Xüsusi hallarda, harmonik ossilyator üçün hal sıxlığı funksiyası ossilyasiya edir.

## Ədəbiyyat

1. Əsgərov, B., Fiqarova, S. və Xasıyeva, G. (2015). Mürəkkəb formalı kvant quyusunda ikiölçülü elektron qazın kimyəvi potensialı. *AMEA Xəbərləri. Fizika-texnika və riyaziyyat elmləri seriyası, fizika və astronomiya*, 2, 6-11.
2. Əsgərov, B. (2012). Kvant çuxurunda elektronların hal sıxlığı funksiyası. *Bakı Universitetinin Xəbərləri. Fizika-riyaziyyat elmləri seriyası,* 4, 101-106.
3. Babayev, Kh., & Sultanova, M. (2009). Dependence of electron mobility on their surface density in a semiconductor quantum well with the modified Poschl-Teller confining potential. *Fizika*, 25, 22-24.
4. Chickering, W., & Eisenstein, J. (2009). *Phys. Rev. Lett*., 103, 1-4.
5. Figarova, S., Hasiyeva, G.., & Figarov, V. (2016). Negative differential conductivity in quantum well with complex potential profile for electron-phonon scattering. *Physica E: Low dimensional Systems and Nanostuctures*, 78, 10-13.

6. Figarova, S., Khasiyeva, G., & Mahmudov, M. (2014). Fermi level of two dimensional electron gas in quantum well. *Abstract book of 31th International Physics Congress*.
7. Hashimzade, F., Babayev, M., & Mehdiyev, B. (2010). *Journal of Physics: Conference Series*, 245.
8. Mircea, D. (2017). *Nanoelectronics Physics and Devices of Atomically*. Thin Material Springer International Publishing AG.
9. Madkour, L. (2019). *Nanoelectronic Materials. Fundamentals and Applications*.
10. Askerov, B. (1985). *Elektronnyye yavleniya perenosa v poluprovodnikakh*. Nauka.
11. Lykova, S. (2008). *Energeticheskiye spektry nanostruktur*. Izdatel'stvo Politekhnicheskogo Universiteta.
12. Shchvartsburg, A. (2002). Elektromagnitnykh voln v sloistykh i neistatsionarnykh sredakh. *ZHETF*, 12, 1321-1322.

Daxil oldu: 01.10.2024
Baxışa göndərildi: 22.10.2024
Təsdiq edildi: 01.11.2024
Çap olundu: 20.11.2024

## İÇİNDƏKİLƏR

### HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
### HUMANITIES AND SOCIAL SCIENCES

## TƏBİƏT ELMLƏRİ

## NATURAL SCIENCES



## TEXNİKA ELMLƏRİ

## TECHNICAL SCIENCES



## RİYAZİYYAT VƏ MEXANİKA

## MATHEMATICS AND MECHANICS

